## TİBB VƏ ƏCZAÇILIQ ELMLƏRİ

## MEDICAL AND PHARMACEUTICAL SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/38/7-11

**İbadulla Ağayev**
Azərbaycan Tibb Universiteti
tibb elmləri doktoru
amuepid@mail.ru
**Xatirə Xələfli**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
khalafli@mail.ru
**Məhərrəm Niftullayev**
Azərbaycan Tibb Universiteti
tibb elmləri doktoru
mniftullayev@gmail.com
**Bayram Əsədov**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
bayramniyazalioglu@mail.ru
**Dəstə Qasımova**
Azərbaycan Tibb Universiteti
qasimovadasta@gmail.com

# ÜRƏYİN İŞEMİYA XƏSTƏLİYİNİN İNKİŞAFININ RİSK AMİLLƏRİ

**Xülasə**

Məqalədə ürəyin işemiya xəstəliyinin inkişafının risk amillərin epidemiologiyasına dair qısa məlumatlar verilmiş, son illər bu xəstəliklərin öyrənilməsi üzrə əldə edilən uğurlar və təcrübədə risk amillərin aşkar edilməsi paylaşılmışdır. Ürəyin işemiya xəstəliyi (ÜİX) daxili xəstəliklər klinikasında başlıca problem sayılır və XXI əsrin epidemiyası kimi xarakterizə olunur. Müxtəlif yaş qruplarında insanların ürəyin işemiya xəstəlikləri ilə xəstələnməsinin tezliyinin getdikcə artması, iş qabiliyyətinin itirilməsinin yüksək payı, həmçinin onun letallığının aparıcı səbəblərindən biri olması buna zəmin yaradır. Əhalinin ürək-damar xəstəlikləri, o cümlədən stenokardiya və miokard infarktı ilə xəstələnmənin çoxillik dinamikasının təhlili onların sayının artmasına doğru cüzi meyllik aşkar etmişdir. Əhalinin ürək-damar xəstəliklərinin insidentliyi nəzərə çarpan regional fərqlərə malikdir ki, bu da çoxsaylı amillərlə bağlıdır. İndi artıq ənənəvi olaraq risk amilləri adlandırılan tam bir sıra amillər kifayət qədər məlumdur ki, onlar həqiqətən ÜİX-dən xəstələnmə və ölüm riskini artırırlar.

***Açar sözlər:*** *epidemiologiya, profilaktika, ürəyin işemiya xəstəliyi, qeyri-yoluxucu xəstəliklər, diaqnostika, risk amilləri, epidemioloji aspektlər*

**Ibadulla Aghayev**
Azerbaijan Medical University
doctor of medical sciences
amuepid@mail.ru
**Khatira Khalafli**
Azerbaijan Medical University
doctor of philosophy in medicine
khalafli@mail.ru

**Maharram Niftullayev**
Azerbaijan Medical University
doctor of medical sciences
mniftullayev@gmail.com
**Bayram Asadov**
Azerbaijan Medical University
doctor of philosophy in medicine
bayramniyazalioglu@mail.ru
**Dasta Gasimova**
Azerbaijan Medical University
qasimovadasta@gmail.com

# Risk factors for the development of ischemic heart disease

## Abstract

In the article, brief information on the epidemiology of risk factors for the development of ischemic heart disease was given, the successes achieved in the study of these diseases in recent years and the detection of risk factors in practice were shared. Ischemic heart disease (IHD) is considered a major problem in the internal medicine clinic and is characterized as an epidemic of the 21st century. This is due to the increasing frequency of people suffering from ischemic heart diseases in different age groups, a high share of the loss of working capacity, as well as the fact that it is one of the leading causes of its lethality. The analysis of the long-term dynamics of the incidence of cardiovascular diseases, including angina pectoris and myocardial infarction, revealed a slight tendency towards an increase in their number. The incidence of cardiovascular disease in the population has marked regional differences, which are related to numerous factors. A whole range of factors, traditionally called risk factors, is now sufficiently well known to actually increase the risk of morbidity and mortality from IHD.

***Keywords:*** *epidemiology, prevention, ischemic heart disease, non-infectious diseases, diagnostics, risk factors, epidemiological aspects*

## Giriş

Müasir dövrdə ürəyin işemik xəstəliyi (ÜİX) bütün dünya ölkələrində sərbəst xəstəlik kimi nəzərdən keçirilir, onun yaranmasının əsasında miokardın zədələnməsi durur ki, bu da aterosklerozla əlaqədar olaraq onun qan təchizatının natamam olması və adətən onun fonunda meydana çıxan tromboz və ya ürəyin tac arrteriyalarının (koronar) spazmı ilə şərtlənmiş və «Xəstəliklərin, travmaların ölümün səbəblərinin Beynəlxalq statistik təsnifatına» daxil edilmişlər (Ağayev, 2022: 85). Ürəyin işemik xəstəliyinə aşağıdakı formalar daxildir:

- qan dövranının birincili dayanması;
- stenokardiya;
- miokard infarktı;
- ürək çatışmazlığı;
- aritmiyalar.

Əsas diqqət miokard infarktına - ürəyin işemik xəstəliyinin ən ağır və geniş yayılmış kəskin formasına yönəldilmişdir. Kəskin miokard infarktı dedikdə, koronar arteriyanın qəfləti okklyuziyası ilə törədilən və miokardın nekrozuna gətirib çıxaran patoloji vəziyyət başa düşülür. Epidemioloji tədqiqatların məlumatlarının sayəsində müasir dövrdə Avropa kardioloqları cəmiyyətinin Birləşmiş komitəsi və Amerika kardioloqları komitəsi tərəfindən miokard infarktı hadisəsinin standart təyini işlənib hazırlanmışdır (Ağayev, 2022: 684).

Ürəyin işemiya xəstəliyi (ÜİX) daxili xəstəliklər klinikasında başlıca problem sayılır və XXI əsrin epidemiyası kimi xarakterizə olunur. Müxtəlif yaş qruplarında insanların ürəyin işemiya xəstəlikləri ilə xəstələnməsinin tezliyinin getdikcə artması, iş qabiliyyətinin itirilməsinin yüksək

payı, həmçinin onun letallığının aparıcı səbəblərindən biri olması buna zəmin yaradır. Xəstəliklərin Beynəlxalq təsnifatının sonuncu baxışında ürək-damar patologiyası qan dövranı sistemi xəstəliklərinin tərkibində qeydə alınmışdır (Rezende, 2019: 1005).

Hələ XX yüzilliyin sonunda ÜİX dünyanın əksər ölkələrində əhalinin əmək qabiliyyətli hissəsi arasında yüksək xəstələnmə, ölüm, əmək qabiliyyətinin daimi və müvəqqəti itirilməsi ilə əlaqədar kəskin xarakter almışdır ki, bu da müasir cəmiyyətə böyük iqtisadi ziyan vurur (Fryar, 2012: 6). Yeni yüzillikdə ÜİX-yə görə vəziyyət daha da ağırlaşmaqdadır. Bunun nəticəsi olaraq, ÜST belə bir nəticəyə gəldi ki, əhali arasında ÜİX-nin yayılması bəşəriyyətə çox böyük iqtisadi ziyan vuran epidemiya xarakteri almışdır və ölkələrin hökümətlərinə ÜİX-nin və onun əsas risk amillərinin yayılma səbəblərini dürüst aşkara çıxarmaq üçün geniş miqyaslı epidemioloji tədqiqatların təşkil edilməsi və regional xüsusiyyətlər nəzərə alınmaqla, bu xəstəliyin çoxamilli profilaktikasının həyata keçirilməsi çağırışı ilə müraciət etdi. ÜST-nin himayəsi altında dünyanın ən görkəmli mütəxəssisləri tərəfindən MONİKA adı altında birləşdirilmiş prospektiv-epidemioloji elmi tədqiqatlar proqramları işlənib hazırlandı (WHO, 2019: 8).

Əhalinin ürək-damar xəstəlikləri, o cümlədən stenokardiya və miokard infarktı ilə xəstələnmənin çoxillik dinamikasının təhlili onların sayının artmasına doğru cüzi meyllik aşkar etmişdir. Əhalinin ürək-damar xəstəliklərinin insidentliyi nəzərə çarpan regional fərqlərə malikdir ki, bu da çoxsaylı amillərlə bağlıdır. Ürək-damar xəstəliklərinin insidentliyinin və ölümün təhlili xəstəliklərin bu qrupunun əhalinin yaş strukturundan asılı olmasını göstərir (Kundapur, 2022: 4).

ÜST-ün himayəsi altında hələ keçən əsrin 60-cı illərində dünyanın müxtəlif ölkələrində ürək-damar patologiyasının inkişafının risk amillərinin aşkar edilməsi üzrə bir sıra epidemioloji tədqiqatlar aparılmışdır (Khalequzzaman, 2017: 9). Nəticədə 2 qrup amillər aşkar edilmişdir. Birinci qrupa sosial xarakterli amillər daxildir – bu qrupda öz növbəsində şərti olaraq «ənənəvi» (və ya klassik) adlandırılan risk amilləri ayırd edilir. Onların arasında birinci yeri siqaret çəkmə tutur və ÜİX-nin, periferik arteriyaların aterosklerozunun və beyin insultunun modifikasiya olunan risk amillərindən ən mühümü sayılır.

Müəyyən edilmişdir ki, siqaret çəkmə ürək-damar xəstəliklərinin inkişaf riskini 3 dəfə artırır. Prospektiv müşahidələrin məlumatları göstərmişdir ki, 40-59 yaşda olan kişilərdə siqaret çəkmənin atributiv riski ÜİX-dən ölüm üçün 41%, miokard infarktından ölüm üçün 21% təşkil edir. 30-39 yaşlı qadınlar arasında siqaret çəkmənin aşağı səviyyədə yayılması sayəsində ürək-damar xəstəliklərindən ölüm üçün bu zərərli vərdişin atributiv riski kişilərə nisbətən aşağıdır və ÜİX üçün 7%, miokard infarktı üçün 10% təşkil edir. Siqaret çəkənlərin orqanizmində baş verən dəyişikliklər müxtəlif olub, metabolik və hormonal prosesləri əhatə edir. Siqaret çəkmə arterial hipertoniyanın və damar zədələnmələrinin digər amillərinin qarşılıqlı təsirini artırır (Agaba, 2019: 5).

ÜİX-nin birincili profilaktikası qismində siqaret çəkmənin dayandırılmasının effektivliyinin qiymətləndirilməsi üzrə aparılan 3 randominizə olunmuş tədqiqatlarda siqareti çəkməyi atan şəxslərdə əlverişsiz sonluğun tezliyi 7-47%-ə qədər azalır (Adam, 2016: 394). Deməli, sübutedici təbabətin məlumatları ürək-damar xəstəliklərinin inkişafının qeyri-dərman profilaktikası qismində siqaretdən tam imtinanın istifadə edilməsinə imkan verir.

Təsir dərəcəsinə görə 2-ci risk amili - səmərəsiz xarakterli qidalanmadır. Qeyd edilir ki, xörək duzunun həddən artıq qəbulu və rasionda tərəvəzlərin azaldılması arterial hipertoniyanın formalaşmasına kömək edir, orqanizmə yüksək miqdarda qəbul edilən doymuş yağ turşuları isə doymamış yağ turşularının kifayət miqdarda işlədilməməsi zamanı qanda xolesterinin yüksəlməsini şərtləndirir (Haque, 2016: 138). Bundan başqa, bir sıra tədqiqatçıları piylənmənin dərəcəsi və ürək-damar xəstəliklərindən xəstələnmə və ölümün artması arasında sıx əlaqənin olmasını qeyd edirlər (Gbadamosi, 2020: 8). Piylənmə və ürək-damar xəstəlikləri arasında əlaqə öz aralarında bir sıra amillərin (ateroskleroz, arterial hipertoniya, lipid, karbohidrat metabolizminin pozulması, ürək-damar sistemində müxtəlif anatomik və funksional kənaraçıxmalar və hemodinamikanın dəyişilməsi ilə bərabər ürəyin qoşulması, artıq bədən çəkisi) birgə təsadüf etməsindən asılıdır (Budreviciute, 2020: 10).

Ürək-damar patologiyasının meydana çıxması üçün mühüm risk amili aşağı fiziki aktivlik hesab edilir. Müəyyən edilmişdir ki, sağlam şəxslərdə və ürəyin koronar xəstəliyi olan xəstələrdə mülayim intensivlikli dinamik fiziki işlər lipidlərin daşınması sistemində bəzi dəyişikliklərə: lipoproteidlərin səviyyəsinin azalmasına gətirib çıxarır. Qeyd etmək vacibdir ki, hamıya məlum olan (ənənəvi) risk amilləri müasir dövrdə daha «bədxassəli xarakter» daşıyırlar. Ənənəvi amillərin səviyyəsinin mülayim artması qlobal (yekun) riskin xeyli artmasına şərait yaradır (Ağayev, 2022: 88). Psixoemosional gərginlik ÜİX-nin və aterosklerozun inkişafının mühüm amillərindən biri hesab edilir. Bəzi peşə sahiblərində gənc yaşlarda aterosklerozun sürətlə inkişaf etməsi məhz bu amillə bağlıdır.

Mənfi emosional təsirin ÜİX ilə qarşılıqlı əlaqəsi heç də həmişə bilavasitə stress dövründə aşkar edilmir, ondan bir müddət (hətta xeyli) keçdikdən sonra təzahür edə bilər. Emosional stress fərdidir, əhali üçün ümumi streslə (müharibə, təbii fəlakətlər) müqayisədə məhdud yönümlüdür, ÜİX-nin risk amili kimi nəzərdən keçirilə bilər. Lakin məlum deyildir ki, bu təsir bilavasitə, yoxsa digər risk amilləri vasitəsilə - dolayı təsir göstərir (Ağayev, 2022: 92).

Son illərin prospektiv tədqiqatlarının məlumatları onu sübut edir ki, depressiya da həmçinin ürəyin işemik xəstəliyinin (ÜİX) müstəqil risk amili hesab edilir və ümumi qəbul edilmiş bir çox risk amilləri, məsələn, dislipidemiya, arterial hipertoniya və siqaret çəkmə ilə birlikdə tədqiq edilməlidir. Xəstəliyin proqnozuna depressiyanın mənfi təsirini sübutedici təbabətin məlumatları da təsdiq edir: miokard infarktını keçirmiş və depressiyadan əziyyət çəkən xəstələrdə ölümün səviyyəsi miokard infarktını keçirmiş və depressiya əlamətləri olmayan xəstələrlə müqayisədə 3-6 dəfə yüksəkdir (Ağayev, 2022: 95).

## Nəticə

İndi artıq ənənəvi olaraq risk amilləri adlandırılan tam bir sıra amillər kifayət qədər məlumdur ki, onlar həqiqətən ÜİX-dən xəstələnmə və ölüm riskini artırırlar. Başqa sözlə, ÜİX ilə əlaqədar vaxtından qabaq xəstələnmə və ölümün baş verməsinin qismən də olsa, elmi cəhətdən əsaslandırılmış izahı var. Problem ondan ibarətdir ki, indiyə qədər aparılan tədqiqatların əksəriyyəti kifayət qədər fraqmentardır. Ona görə də, artıq mövcud olan təcrübə nəzərə alınmaqla genişləndirilməsi lazım gələn, lakin məhz bu regionun xüsusiyyətlərini əks etdirən konkret elmi faktlara istinad edən regional proqramların tərtibinə mühüm əhəmiyyət verilir. Bu səbəbdən, əhalinin öz sağlamlığına olan münasibətinin və sağlamlaşdırıcı və profilaktik tədbirlərin aparılmasında fəal iştirak etməyə hazır olmalarının qiymətləndirilməsindən ibarət olan ilkin vəziyyətin öyrənilməsi, sağlamlığın və patoloji vəziyyətlərin indikatorlarının ilkin səviyyəsinin, patologiyaların baş verməsi ilə əlaqəsi baxımından ayrı-ayrılıqda və cəm şəklində risk amillərinin müxtəlif səviyyəsinin məlumatlarının və onların əsasında bu patologiyaların proqnozlaşdırılması imkanlarının öyrənilməsi, gözlənilən effektivlik, o cümlədən iqtisadi effektivlik nəzərə alınmaqla populyasiya səviyyəsində bu amillərə təsir etməyin yolları və imkanlarının öyrənilməsi zəruridir.

## Ədəbiyyat

1. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva, F.Ş. (2022). Epidemiologiya (Milli rəhbərlik). Bakı.
2. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva, F.Ş. (2022). Qeyri-infeksion xəstəliklərin epidemiologiyası. Bakı.
3. Fryar, C.D., Chen, T.C., Li, X. (2012). Prevalence of uncontrolled risk factors for cardiovascular disease: United States, 1999-2010. NCHS data brief. № 103. Hyattsville, MD: National Center for Health Statistics.
4. Rezende, P.C., Ribas, F.F. (2019). Vicente C. Clinical significance of chronic myocardial ischemia in coronary artery disease patients. *J Thoracic Dis*. Vol.11 (3), pp.1005-1015.
5. WHO. (2019). Ten threats to global health https://www.who.int/news-room/spotlight/ten-threats-to-global-health-in-2019

6. Kundapur, B., Modi, P. Shenoy, l. (2022). Activity adaptation towards control of selected noncommunicable diseases-A detailed part of large community trial in rural areas of India. J Fam Med Prim Care.
7. Khalequzzaman, M., Chiang, C., Hoque, B.A. (2017). Population profile and residential environment of an urban poor community in Dhaka, Bangladesh. J. Environ Health Prev Med.
8. Adam, M.E., Garelnabi, M.E., Sakin, G.A., Omer, M.A. (2016). Assessment of Ischemic Coronary Arteries Prevalence. *Indian J Res.*
9. Agaba, E.I., Akanbi, M.O., Agaba, P.A. (2019). A survey of non-communicable diseases and their risk factors among university employees: a single institutional study. South African Journal of Diabetes and Vascular Disease
10. Haque, A.T., Yusoff, F.B, Bin Ariffin, M.H. (2016). Lipid profile of the Coronary heart disease (CHD) patients admitted in a hospital in Malaysia. *J Appl Pharm Sci*.
11. Gbadamosi, M.A. (2020). Tlou B. Modifiable risk factors associated with non-communicable diseases among adult outpatients in Manzini, Swaziland: a cross-sectional study. *BMC Public Health*.
12. Budreviciute, A., Damiati, S., Sabir, D.K. (2020). Management and prevention strategies for non-communicable diseases and their risk factors. *Front Public Heal*.

Göndərilib: 27.08.2023 Qəbul edilib: 01.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/12-17

**Aytac Şükürlü**
Azərbaycan Tibb Universiteti
magistrant
sukurluaytac987@gmail.com
**Tahirə Əsgərova**
Azərbaycan Tibb Universiteti
biologiya elmləri doktoru
sukurluaytac987@gmail.com

# DƏMİR MÜBADİLƏSİNİN POZULMASI QARACİYƏR SİRROZUNUN YARANMA SƏBƏBLƏRİNDƏN BİRİ KİMİ

## Xülasə

Qaraciyər sirrozu sağlam qaraciyər toxumasının tədricən funksiyasının pozulması ilə xarakterizə olunan xroniki qaraciyər xəstəliyidir. Bir neçə amil qaraciyər sirrozunun inkişafına səbəb olsa da, dəmir mübadiləsinin pozulması tədircən daha çox xəstəliyin ağırlaşmasına gətirib çıxaran ən vacib səbəb kimi tanınır.

Dəmir orqanizmdə müxtəlif fizioloji prosesləri, o cümlədən oksigenin daşınmasını, enerji istehsalını və hüceyrə metabolizmini həyata keçirən vacib mikroelementdəndir. Bununla belə, qaraciyərdə həddindən artıq dəmirin yığılması oksidləşdirici stresə, iltihaba və toxumaların zədələnməsinə və nəticədə sirroza gətirib çıxara bilər. Bu məqalədə qaraciyər sirrozunun yaranma səbəblərindən biri kimi pozulmuş dəmir mübadiləsinin rolu, əlaqəli mexanizmlər, risk faktorları və potensial terapevtik müdaxilələr araşdırılacaq.

***Açar sözlər:*** *sirroz, dəmir, qaraciyər, xroniki, orqanizm*

**Aytaj Shukurlu**
Azerbaijan Medical University
master student
sukurluaytac987@gmail.com
**Tahira Asgarova**
Azerbaijan Medical University
doctor of biological sciences
sukurluaytac987@gmail.com

# Disorder of iron metabolism as one of the causes of liver cirrhosis

## Abstract

Cirrhosis of the liver is a chronic liver disease characterized by the gradual deterioration of the function of healthy liver tissue. Although several factors contribute to the development of liver cirrhosis, iron metabolism disorders are gradually becoming more and more recognized as the most important cause of disease progression.

Iron is an important trace element that performs various physiological processes in the body, including oxygen transport, energy production and cell metabolism. However, excessive iron accumulation in the liver can lead to oxidative stress, inflammation, and tissue damage, ultimately leading to cirrhosis. This article will examine the role of impaired iron metabolism as a cause of liver cirrhosis, the associated mechanisms, risk factors, and potential therapeutic interventions.

***Keywords:*** *cirrhosis, iron, liver, chronic, organism*

## Giriş

Dəmir mübadiləsinin pozulması ilə qaraciyər sirrozu arasındakı əlaqəni anlamaq üçün ilk növbədə orqanizmdə dəmir mübadiləsini və homeostazı araşdırmaq lazımdır (Barutçuoglu, Bozdemir, Baflol, 2007:5). Dəmir ilk növbədə qida mənbələrindən alınır, udulması onikibarmaq bağırsaqda baş verir. Udulduqdan sonra dəmir, dəmiri hədəf toxumalara və hüceyrələrə çatdıran bir qlikoprotein ilə transferrinə birləşərək qan dövranına keçir (Corradini, Ferrara, Pollicino, 2007:3).

Qaraciyər dəmir mübadiləsində mərkəzi rol oynayır. Həddindən artıq dəmiriferritin şəklində toplanır və lazım olduqda ondan istifadə edilir. Bundan əlavə, qaraciyər enterositlərin, makrofaqların və hepatositlərin səthində olan ferroportin zülalı vasitəsilə hepcidini sintez edərək dəmirin udulmasını tənzimləyir. Hepcidinin səviyyəsi yüksək olduqda, ferroportin parçalanır, dəmir ixracını azaldır və qaraciyərdə dəmir səviyyəsini artırır. Əksinə, hepcidinin aşağı səviyyəsi hepatositlərdə dəmirin miqdarının artmasına və bağırsaqda dəmirin udulmasının sürətlənməsinə səbəb olur (Jurczyk, Wawrzynowicz-Syczewska, Boroń-Kaczmarska, Sych, 2001:2).

Həm dəmir çatışmazlığının, həm də dəmirin həddindən artıq yüklənməsinin qarşısını almaq üçün dəmir homeostazı ciddi şəkildə idarə olunmalıdır (Anderson, 2013:8). Bu tənzimləmə bədənin əsas funksiyalarını yerinə yetirmək üçün kifayət qədər dəmir ehtiyatına malik olmasını təmin edir, eyni zamanda artıq dəmir yığılmasının toksik təsirlərinin qarşısını alır (Datz, Felder, Niederseer, Aigner 2013:3).

Qaraciyər sirozunda dəmir mübadiləsinin tənzimlənməsi pozula bilər ki, bu da qaraciyərdə dəmir yüklənməsinə səbəb olur. Həddindən artıq dəmir yükü dedikdə qaraciyərin toxumalarında dəmirin həddindən artıq yığılması nəzərdə tutulur. Bu vəziyyət tez-tez xroniki qaraciyər pozulmalarında, o cümlədən alkoqollu qaraciyər, alkoqolsuz yağlı qaraciyər və viral hepatit olan xəstələrdə müşahidə olunur [Bataller, Cabezas, Aller, Abad, 2019:7].

Həddindən artıq spirtdən istifadə edilməsi qaraciyər sirozunun ümumi səbəblərindən biridir. Alkoqoldan asılı qaraciyər xəstəliyində (AQX) qaraciyərin zədələnməsi bağırsaqdan dəmirin udulmasının artmasına və alkoqolun hepatositlərə toksik təsiri səbəbindən qaraciyərdən dəmirin xaric edilməsi prosesinin pozulmasına səbəb ola bilər. Bütün bu faktorlar qaraciyərdə dəmirin yığılması ilə nəticələnir, qaraciyərin zədələnməsini şiddətləndirir və fibrozu inkişaf etdirir (Kim, Ejaz, Tayal, 2014:5).




**Şəkil 1. Sirroz olan xəstənin qaraciyərindəki dəyişiklikləri**

Alkoqolsuz yağlı qaraciyər xəstəliyi (AYQX) piylənmə, insulin müqaviməti və metabolik sindromla əlaqəli olan geniş yayılmış qaraciyər xəstəliyidir. Tədqiqatlar göstərdi ki, AYQX olan insanlarda tez-tez qaraciyərdə dəmir səviyyəsinin artmasına səbəb olur ki, bu da qaraciyər fibrozunun inkişafına təkan verə bilər. AYQX-də dəmirin yığılmasının əsas mexanizmləri

mürəkkəbdir və bunu həm dəmirin udulmasının artması, həm də dəmirin ixracının pozulması ilə əlaqələndirmək olar (Liu, Meyer, Xu, 2013:23).

Xroniki viral hepatit, xüsusilə hepatit C və hepatit B də qaraciyər sirrozuna səbəb ola bilər. Hepatit virusları müxtəlif mexanizmlər vasitəsilə dəmir mübadiləsini, o cümlədən dəmiri tənzimləyən zülallarla birbaşa qarşılıqlı əlaqəni və xroniki iltihabın induksiyasını poza bilər (Bayram, Türkay, 2010:6).

Bədəndə həddindən artıq miqdarda dəmir yığılması müxtəlif orqan və sistemlərin zədələnməsinə və bununla bağlı olaraq xəstəliklərin yaranmasına səbəb olur. Bunlardan biri də Hemaxromatoz xəstəliyidir. Hemaxromatoz termini bütün dəmir yığılması xəstəliklərini əhatə edir. Hemaxromatozun birincili (irsi) və ikincili tipləri aid edilir (Tüzün, Yakut, 2009:1). Dəmir yığılması xəstəliklərinin bəzilərində xəstəliyin altında yatan ikinci dərəcəli pozulma yoxdur və bunlara birincili hemaxromatoz deyilir. Birincili hemaxtromatoz bağırsaqdan dəmirin sorulmasının artdığı və hər hansı bir ikinci xəstəlik tapılmayan formasıdır (Valenti, Fracanzani, Dongiovanni, 2014:2). İkincili hemaxromatoz, xüsusilə təsirsiz eritropoez kimi bir hematoloji xəstəlik səbəbi ilə qan köçürülməsi nəticəsində görülən formadır. Hemaxromatoz geni (HFE) 6-cı xromosomda, HLA-A lokusunda yerləşir. İrsi Hemaxromatoz adətən HFE genində C282Y və/və ya H63D mutasiyası ilə xarakterizə olunur. Cəmiyyətdə Herediter Hemaxromatoz (HH) olan xəstələrin 69-100%-də C282Y homoziqotluğu aşkar edilir. HFE geninin funksiyası plazma membranında yerləşən Transferrin reseptoru (Tfr) ilə qarşılıqlı əlaqədə olaraq Tfr-nin transferrinə yaxınlığını azaltmaqdır. HFE mutant geni (C282Y) β-2 mikroqlobulinlə bağlana bilməz. HFE-β-2 mikroqlobulin kompleksi hüceyrə membranında Tfr ilə qarşılıqlı əlaqədə ola bilməz və onun transferrinə olan yaxınlığını azalda bilməz, nəticədə bu da onikibarmaq bağırsaqdan və yuxarı nazik bağırsaqdan dəmirin həddən artıq sorulmasına səbəb olur. Ən çox yayılmış forma HFE geni ilə əlaqəli HH olsa da, müəyyən edilmiş yeni mutasiyalarla xəstəliyin digər alt qrupları da aşkar edilmişdir. Dəmir yüklənməsinin digər irsi formaları qeyri-HFE ilə əlaqəli HH adlanır. Genetik dəmirin həddindən artıq yığılması xəstəliklərinin təsnifatında, tip 1 HFE gen mutasiyası ilə müşayiət olunan klassik HH-nı təyin edir. Tip 2 yetkinlik yaşına çatmayan hemoxromatoz adlanan iki genetik mutasiyanı əhatə edir və erkən yaşda dəmirin daha artıq yığılması ilə xarakterizə olunur. Tip 2A hemojuvelin (HJV) mutasiyasını yaradan tip olduğu halda, Tip 2A HAMP gen mutasiyasının müşahidə olunduğu hepcidin funksiyasının ciddi şəkildə itirildiyi tipdir. Tip 3, yetkinlik dövründə transferrin reseptor-2 TfR2 mutasiyası səbəbiylə meydana gələn və klassik HFE gen mutasiyasının klinik xüsusiyyətlərinə bənzər bir xəstəlik növüdür. Tip 4, ferroportin mutasiyasından yaranan həddindən artıq dəmir yükü xəstəliyidir. İrsi hemaxromatozun bir çox növlərində hepcidin istehsalının çatışmazlığı və ya onun reseptoruna bağlana bilməməsi diqqəti çəkir. Bu, hepcidin irsi dəmir yığılması xəstəliklərində və dəmirin tənzimlənməsində ümumi bir nöqtə olduğunu vurğulayır (Tüzün, Yakut, 2009:6).

Dəmir metabolizmasını pozan və qaraciyər sirrozunun yaranma ehtimalını artıran bir neçə risk faktoru var. Bunlar aşağıdakılardır:

**1. Genetik faktorlar:** İrsi hemaxromatoz kimi bəzi genetik mutasiyalar qaraciyərdə dəmirin yığılmasına səbəb ola bilər. İrsi hemaxromatoz, hepcidin tənzimlənməsini pozan və dəmirin həddindən artıq yüklənməsinə səbəb olan HFE kimi genlərdə mutasiyalarla xarakterizə olunan autosom resessiv xəstəlikdir.

**2. Alkoqol istifadəsi:** Xroniki spirt istifadəsi dəmirin udulmasını gücləndirərək qaraciyərdən dəmir ixracını pozur. Alkoqoldan çox istifadə edən şəxslərdə alkoqollu qaraciyər xəstəliyinin və sirrozun yaranma riski artır.

**3. Metabolik pozğunluqlar:** Piylənmə, insulin müqaviməti və metabolik sindrom kimi vəziyyətlər alkaqolsuz yağlı qaraciyər xəstəliyi və qaraciyərdə dəmir yüklənməsi ilə əlaqələndirilir. Bu metabolik pozğunluqlar və dəmir mübadiləsi arasındakı qarşılıqlı əlaqə qaraciyər xəstəliyinin inkişafına səbəb ola bilər.

**4. Xroniki Viral Hepatit:** Viral hepatit, xüsusən də hepatit B və C, müxtəlif mexanizmlər vasitəsilə dəmir mübadiləsini poza bilər. Bu hepatit növləri xroniki viral infeksiyaları olan şəxsləri qaraciyərdə dəmir yüklənməsinə və sirroza qarşı daha həssas edir (Ramm, Ruddell, 2005:14).




**Şəkil 3. Qaraciyər sirrozunun patogenizi**

Qaraciyər sirrozu kontekstində həddindən artıq dəmir yüklənməsinin diaqnozu klinik, laboratoriya və görüntüləmə nəticələrinin qiymətləndirməsini və təhlil edilməsini tələb edir (Mekhtiev,2014:4). Sirrozlu xəstələrdə dəmirin vəziyyətini qiymətləndirmək üçün adətən aşağıdakı üsullardan istifadə olunur:

**1. Serum Dəmir Parametrləri:** Qan testləri dəmir mübadiləsinin müxtəlif markerlərinin, o cümlədən serum dəmiri, transferrin saturasiyası (TSAT), serum ferritini və ümumi dəmir bağlama qabiliyyətini (TİBC) ölçə bilər. Yüksək serum ferritin səviyyələri və TSAT həddindən artıq dəmir yüklənməsinin göstəricisidir.

**2. Qaraciyər biopsiyası:** Qaraciyərin dəmir tərkibini birbaşa qiymətləndirmək üçün qaraciyər biopsiyası aparıla bilər. Qaraciyər toxumasının dəmirlə boyanması dəmir səviyyəsinin kəmiyyətcə ölçülməsini təmin edə və dəmirin çökməsinin şiddətini qiymətləndirə bilər.

**3. Qeyri-invaziv üsul:** Maqnit rezonans (MRT) və maqnit rezonans elastoqrafiya (MRE) kimi qeyri-invaziv üsullar biopsiyaya ehtiyac olmadan qaraciyərdə dəmir tərkibini və qaraciyər fibrozunu qiymətləndirmək üçün istifadə edilə bilər.

**4. Genetik test**: İrsi hemaxromatozu və ya pozulmuş dəmir metabolizmi ilə əlaqəli digər genetik mutasiyaları müəyyən etmək üçün genetik test hesab edilə bilər.

**5. Klinik Qiymətləndirmə**: Kliniki qiymətləndirməyə qaraciyər funksiyası testləri və qeyri-invaziv tədqiqatlara əlavə olaraq dəri piqmentasiyası, oynaq ağrısı və hepatomeqaliya kimi dəmir yüklənməsinin əlamətləri, simptomlarının qiymətləndirilməsi daxildir (Levitan, 2017:3).

Qaraciyər sirrozu olan xəstələrdə həddindən artıq dəmir yüklənməsinin tənzimlənməsi xəstəliyin gedişatını və ağırlaşma riskini azaltmaq üçün çox vacibdir. Müalicə strategiyaları dəmir səviyyəsini normallaşdırmaq, oksidləşdirici stressi azaltmaq və qaraciyərin daha çox zədələnməsinin qarşısını almaq məqsədi daşıyır (Ellis, 2012:9).

Flebotomiya və ya terapevtik qan alma, irsi hemaxromatoz və əhəmiyyətli dəmir yükü olan şəxslər üçün əsas müalicə variantıdır. Müəyyən bir həcmdə qanın dövri olaraq çıxarılması ilə artıq dəmir bədəndə tədricən azalır. Bu yanaşma dəmir səviyyəsini azaltmağa, daha çox orqan

zədələnməsinin qarşısını almağa və simptomları yaxşılaşdırmağa kömək edir (Kowdley, Belt, Wilson, 2016:8).

Dəmir xelat terapiyası bədəndə artıq dəmiri birləşdirən və onun xaric olmasını asanlaşdıran dərmanların istifadəsini nəzərdə tutur. Bu müalicə daha çox talassemiya və miyelodisplastik sindromlarla əlaqəli olsa da, qaraciyər sirrozu və flebotomiya keçirə bilməyən dəmir yükü olan şəxslər üçün də nəzərdə tutula bilər (Paterson, Pietrangelo, 2011:5).

Əsas qaraciyər xəstəliyinin müalicəsi qaraciyərdə dəmir yüklənməsinin və sirrozun idarə edilməsində vacibdir.Qaraciyər xəstəliyinin səbəblərindən asılı olaraq müxtılif müalicə üsulları mövcuddur. Bunlar aşağıdakıları əhatə edə bilər:

**1. Alkoqolun dayandırılması**: Alkoqollu qaraciyər xəstəliyi üçün ilk addım tez-tez spirt istifadəsini dayandırmaqdır. Bu, daha çox qaraciyər zədələnməsinin qarşısını almağa kömək edər və qaraciyərin müəyyən dərəcədə bərpasına imkan verə bilər.

**2. Antiviral Müalicə:** Viral hepatit (məsələn, hepatit B və C) hallarında antiviral dərmanlar virusun təkrarlanmasının qarşısını almaq, iltihabı azaltmaq və qaraciyər xəstəliyinin inkişafını yavaşlatmaq üçün istifadə olunur.

**3. Həyat tərzi dəyişiklikləri:** Alkaqolsuz yağlı qaraciyər xəstəliyi olan xəstələr insulin həssaslığını yaxşılaşdırmaq və qaraciyərdə yağ yığılmasını azaltmaq üçün kilo itkisi, pəhriz dəyişiklikləri və artan fiziki fəaliyyət daxil olmaqla həyat tərzində dəyişikliklər etməyi tövsiyə edilir.

**4. Metabolik Vəziyyətlərin İdarə Edilməsi:** Piylənmə, insulin müqaviməti və metabolik sindromun idarə edilməsi alkaqolsuz yağlı qaraciyər xəstəliyinin idarə edilməsinə və qaraciyərdə dəmirin həddindən artıq yüklənməsi riskini azaltmağa kömək edə bilər (Trombini, Paolini, Pelucchi, Mariani, Nemeth, Ganz, Piperno, 2011:3).

Qaraciyər sirrozu və dəmir yükü olan xəstələrdə hepatoselüler karsinoma (HCC) kimi ağırlaşmaların inkişaf riski artır.Belə xəstələrdə həddindən artıq dəmir yüklənməsinin diaqnostikası və idarə edilməsi klinik qiymətləndirmə, laboratoriya testləri,qeyri-invaziv üsullar, lazım gəldikdə genetik testləri əhatə edən multidisiplinar yanaşma tələb edir (Bulatova, Shchekotova, Dolgikh, Paducheva, 2022:10). Müalicə strategiyalarına flebotomiya, dəmir şelasiya terapiyası və əsas qaraciyər xəstəliyinin müalicəsi daxil ola bilər. Bundan əlavə, xəstənin nəticələrini yaxşılaşdırmaq və hepatoselüler karsinomanın inkişafının qarşısını almaq üçün ağırlaşmalara müntəzəm nəzarət vacibdir (Milic, Mikolasevic, Orlic, Devcic, Starcevic-Cizmarevic, Stimac, Kapovic, Ristic, 2016:5).

## Nəticə

Qaraciyər sirrozu qaraciyərdə həddindən artıq fibrozun (çapıq) yığılmasını təsvir etmək üçün istifadə edilən tibbi termindir. Qaraciyərdə zədələnməsi zamanı qaraciyər hüceyrələri itir, lakin hüceyrələr sürətlə yenilənmə qabiliyyətinə malikdir və çapıq/fibroz əmələ gəlmir. Zədəyə səbəb olan amil davamlı və ya təkrarlanan olduqda, qaraciyər hüceyrələrinin ölüm-bərpa dövrü ərzində qaraciyərdə çapıq toxuması yığılmağa başlayır.

Dəmir eritropoetik funksiya, oksidləşdirici maddələr mübadiləsi və hüceyrə toxunulmazlığı üçün lazım olduğu üçün vacib elementdir. Dəmir mübadiləsinin tənzimlənməsi çox önəmlidir, çünki dəmirin hüceyrə mübadiləsində və aerob tənəffüsdə rolu böyükdür və dəmirin həddindən artıq yüklənməsi sərbəst radikalların əmələ gəlməsi və lipid peroksidasiyası vasitəsilə hüceyrə ölümünə və toksikliyə səbəb olur. Əksinə dəmir çatışmazlığı hemoglobin istehsalının azalmasına və nəticədə anemiyaya səbəb ola bilər.

Qaraciyər sirrozunda pozulmuş dəmir mübadiləsinin tənzimlənməsi əsas amil götürülür və xroniki qaraciyər xəstəlikləri olan xəstələrin qiymətləndirilməsində vacib rol oynayır. Dəmirin səbəb olduğu qaraciyər zədələnməsinin altında yatan mexanizmlərə dair əlavə tədqiqatlar və məqsədyönlü müalicə üsullarının inkişafı qaraciyər sirozu və həddindən artıq dəmir yükü olan şəxslərin proqnozunu yaxşılaşdırmaq üçün yeni yollar təklif edə bilər.

## Ədəbiyyat

1. Barutcuoglu, B., Bozdemir, A.E., Baflol, G. (2007). Hepcidin, a New Regulator of Iron Homeostasis. Turkey: Turkish Journal of Clinical Biochemistry, 8 p.
2. Corradini, E., Ferrara, F., Pollicino, T. (2007). Disease progression and liver cancer in the ferroportin disease. England: British Society of Gastroenterology, 4 p.
3. Jurczyk, K., Wawrzynowicz-Syczewska, M., Boroń-Kaczmarska, A., Sych, Z. (2001). Serum iron parameters in patients with alcoholic and chronic cirrhosis and hepatitis. Poland: Medical Science Monitor, 5 p.
4. Anderson, E.R., Shah, Y.M. (2013). Iron homeostasis in the liver. America: Comprehensive Physiology, 16 p.
5. Datz, C., Felder, T.K., Niederseer, D., Aigner, E. (2013). Iron homeostasis in the metabolic syndrome. Austria: European Journal of Clinical Investigation, 10 p.
6. Bataller, R., Cabezas, J., Aller, R., Abad, J. (2019). Alcohol-related liver disease. Spain: Gastroenterología y Hepatología, 20 p.
7. Kim, Y., Ejaz, A., Tayal, A. (2014). Temporal trends in population-based death rates associated with chronic liver disease and liver cancer in the United States over the last 30 years. America: Cancer, 8 p.
8. Liu, Y., Meyer, C., Xu, C. (2013). Animal models of chronic liver diseases. Germany: Am J Physiol Gastrointest Liver Physiol, 52 p.
9. Bayram, Y., Turkay, C. (2010). Hereditary Hemochromatosis Diagnosis and Treatment. Ankara: Current gastroenterology, 8 p.
10. Tuzun, Y., Yakut, M. (2009). Iron Metabolism and Hereditary Hemochromatosis. Ankara: Current Gastroenterology, 8 p.
11. Valenti, L., Fracanzani, A L., Dongiovanni, P. (2014). A randomized trial of iron depletion in patients with nonalcoholic fatty liver disease and hyperferritinemia. Italy: World J Gastroenterol, 10 p.
12. Ramm, G.A., Ruddell, R.G. (2005). Hepatotoxicity of iron overload: mechanisms of iron-induced hepatic fibrogenesis. California: Seminars in liver disease, 17 p.
13. Mekhtiev, S.N., Stepanenko, V.V., Zinoveva, E.N., Mekhtieva, O.A. (2014). Modern ideas about liver fibrosis and methods of its correction. Russian: Farmateka, 7 p.
14. Levitan, B.N., Astakhin, A.V., Levitan, G.B. (2017). Tumor necrosis factor and its soluble receptors in chronic hepatitis and liver cirrhosis. Russian: Experimental and Clinical Gastroenterology, 5 p.
15. Ellis, E.L., Mann, D.A. (2012). Clinical evidence for the regression of liver fibrosis. England: Journal of Hepatology, 10 p.
16. Kowdley, K.V., Belt, P., Wilson, L.A. (2016). Serum ferritin is anindependent predictor of histologic severity and advanced fibrosis in patients with nonalcoholic fatty liver disease. America: Hepatology, 9 p.
17. Paterson, A., Pietrangelo, A. (2011). Disorders of iron overload. Italy: LIVER International, 8 p.
18. Trombini, P., Paolini, V., Pelucchi, S., Mariani, R., Nemeth, E., Ganz, T., Piperno, A. (2011). Hepcidin response to acute iron intake and chronic iron loading in dysmetabolic iron overload syndrome. Italy: LIVER International, 7 p.
19. Bulatova, I.A., Shchekotova, A.P., Dolgikh, O.V., Paducheva, S.V. (2022). Circulating Cytokines Reflect the Etiology-Specific Immune Environment in Cirrhosis and HCC. Russian: Science education, 15 p.
20. Milic, S., Mikolasevic, I., Orlic, L., Devcic, E., Starcevic-Cizmarevic, N., Stimac, D., Kapovic, M., Ristic, S. (2016). The Role of Iron and Iron Overload in Chronic Liver Disease. Poland: Medial Science Monitor, 8 p.

Göndərilib: 26.09.2023 Qəbul edilib: 30.10.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/18-22

**Humay Həsənova**
Azərbaycan Tibb Universiteti
magistrant
humayhasanova25@gmail.com
**Gülnarə Əzizova**
Azərbaycan Tibb Universiteti
biologiya elmlər doktoru
gulib18@mail.ru

# OSTEOPOROZ ZAMANI MİNERAL MÜBADİLƏSİNİN KOMPONENTLƏRİ

**Xülasə**

Cəmiyyət üçün əhəmiyyətli bir yük sayılan osteoporoz son illər səhiyyənin aktual bir problemi olub, tədqiqatçıların diqqətini cəlb etməkdədir. Skelet sisteminin geniş yayılmış metabolik mənşəli xəstəliyi sayılan osteoporozun yayılma tezliyi yaş artdıqca artır. Ürək-damar sistemi xəstəlikləri, onkoloji xəstəliklər və şəkərli diabetdən sonra dördüncü yer tutan osteoporozun erkən diaqnostikası əhalinin həyat keyfiyyətinin yaxşılaşdırılmasına gətirib çıxarır. Osteoklastlar ilə osteoblastlar arasında balansın pozulması qanda və sidikdə olan biokimyəvi sümük dövriyyəsi markerlərinin miqdarının dəyişilməsinə səbəb olur ki, bu maddələr osteoporoz zamanı mühüm əhəmiyyət kəsb edir. Bu maddələrə əsasən mineral mübadiləsinin əsas komponentlərini və hormonları aid etmək olar. Təqdim olunan məqalədə sümük sıxlığının dəyişilməsində mühüm rol oynayan biokimyəvi markerlər haqqında ətraflı məlumat verilmişdir.

***Açar sözlər:*** *osteoporoz, osteoklast, osteoblast, kalsium*, fosfor, *maqnezium, D vitamini, parathormon*

**Humay Hasanova**
Azerbaijan Medical University
master student
humayhasanova25@gmail.com
**Gulnara Azizova**
Azerbaijan Medical University
doctor of biological sciences
gulib18@mail.ru

## Components of mineral metabolism during osteoporosis

**Abstract**

Osteoporosis, which is considered a significant burden for society, has been an actual health problem in recent years and is attracting the attention of researchers. The prevalence of osteoporosis, which is considerd as a widespread metabolic disease of the skeletal system, increases with age. Early diagnosis of osteoporosis, which ranks fourth after cardiovascular diseases, oncological diseases and diabetes, leads to improvement of the life quality of population. An imbalance between osteoclasts and osteoblasts leads to changes in the amount of biochemical markers of bone turnover in blood and urine, which are important in osteoporosis. These substances include the main components of mineral metabolism and hormones. The presented article provides detailed information about biochemical markers that play an important role in bone density changes.

***Keywords:*** *osteoporosis, osteoclast, osteoblast, calsium, phosphorus, magnesium, vitamin D, parathormone*

## Giriş

Osteoporoz – sümüyün mineral sıxlığının azalması, kövrəkliyinin artması səbəbindən hətta kiçik travmalar zamanı skelet sisteminin sınıq riskinə gətirib çıxaran və çox rast gəlinən xəstəliyidir (Səfərova, 2016: 7). Bu xəstəlik ilk zamanlarda özünü heç bir əlamətlə biruzə verməməsi səbəbindən bir çox ölkələrdə "səssiz epidemiya" xarakterini almışdır (Səfərova, 2016: 15). Osteoporoz zamanı sümüklərin içərisində boşluqların yaranması onları qırılmağa və çatlamağa meyilli hala gətirir (2). Osteoporozla ən çox süngər tipli sümük adlandırılan əl biləyi, onurğa və çanaq sümüyü sınıqları zamanı qarşılaşırıq (3). Osteoporozun cinsə və yaşa görə yayılma tezliyinə nəzər yetirsək, hormonlardan və sümük kütləsindən asılı olaraq qadınlarda kişilərdən daha çox rast gəlinir və yaş artdıqca artır (Səfərova, 2016: 18). Qadınlarda premenopauza dövründə sümük kütləsinin azalması ilə sınıqlar arasında olan əlaqə postmenopauza dövründə olduğu qədər yüksək səviyyədə olmamasının səbəbi premenopauza dövründə olan qadınlarda estrogenin daha yüksək olması, əzələ kütləsinin daha çox olması, daha aşağı sümük dövriyyəsinə malik olması və bir neçə başqa səbəblərdir (Lewleck, Kendler, Kiebzak, 2004). Osteoporozun dəqiq diaqnozu sümük sıxlığının ölçülməsi ilə aparılır ki, burada ən geniş istifadə edilən üsul DEXA üsuludur. (5) DEXA nəticələri osteoporoz baxımından şərh edildikdə T və Z meyarlarından istifadə olunur. (Watts, Adler, Bileziklan, 2012). T meyarı postmenopauza dövründə olan qadınlarda və 50 yaşdan yuxarı kişilərdə, Z meyarı isə premenopauza dövründə olan qadınlarda və 50 yaşdan aşağı kişilərdə osteoporozun diaqnozu üçün istifadə olunur (Kanis, Burlet, Cooper, 2008). Densitometriyanın rentgen və ultrasəs olmaqla 2 növü var. Sümük sıxlığının və mineral duzların itkisi zamanı sümüyün daha şəffaf görünməsi səbəbindən rentgen densitometriyasından daha geniş istifadə olunur (8).

2000-ci ildə bütün dünyada 9 milyon osteoporotik sınığa rast gəlinmişdir, bunların 1,6 milyonu bud sümüyü sınıqları, 1,4 milyonu isə onurğa sınıqları idi (Giversen, 2007; Ariely, Olson, Cooper, Abrahamsen, van Staa, 2009). 2007-ci ildə Ümumdünya Səhiyyə Təşkilatı tərəfindən qəbul edilmiş təsnifata əsasən, osteoporoz birincili və ikincili osteoporoz olmaqla 2 qrupa bölünür (Abasov, Alimetov, 2012: 212).

Sümükdə olan hüceyrələri osteoblastların yetişmə məhsulu olan osteositlər, osteoklastlar və osteoblastlar olmaqla qruplaşdırmaq olar (Abasov, Alimetov, 2012: 211). Osteoklastlar tərəfindən sümüyün məhv edilməsi ilə osteoblastlar tərəfindən sümüyün yaranması arasında balansın pozulması qanda və sidikdə olan bəzi maddələrin miqdarının dəyişilməsinə səbəb olur ki, bu maddələrə biokimyəvi sümük dövriyyəsi markerləri deyilir (13). Osteoporozun etiopatogenezində mineral mübadiləni tənzimləyən elementlərin, hormonların, zülal və peptid təbiətli tənzimləyicilərin olduqca böyük əhəmiyyəti var. Sümük toxumasının yenidən qurulması prosesində iştirak edən hormonlara parathormon, kalsitonin, insulin, somatotrop hormon, qlükokortikoid hormonlar, kalsitriol hormonu, qalxanabənzər vəzin hormonları, cinsi hormonlar aiddir (Abasov, Alimetov, 2012: 211).

Sümükdə olan mineral mübadiləni tənzimləyən elementlərə əsasən kalsium, fosfor və maqneziumu aid etmək olar. Qanın biokimyəvi analizinə nəzər yetirsək kalsiumun norma daxilində miqdarı 8,8-10,2 mg/dL aralığında olmalıdır. Kalsiumun sümüklərdən qana çıxması osteoporozun inkişafına səbəb olur. Asidozla əlaqədar olaraq kalsium mübadiləsinin pozulması ilə qarşılaşırıq ki, bu da turş mühitin kalsium ilə zəngin olan toxumanı parçalamasına gətirib çıxarır (14). Osteoporozun qarşısını almaq üçün 18-50 yaş arası qadınların gün ərzində 1000 mg kalsium, 800-1500 İU D vitamini qəbul etmələri tövsiyyə edilir (McLendon, Woodis, 2014; Cohen, Shane, 2013).

Postmenopauza dövründə osteoporozun əsas səbəblərinə misal olaraq sümük toxumasının parathormona qarşı həssaslığının artmasını qeyd edə bilərik. Parathormon sümük toxumasının rezorbsiyasına, bağırsaqdan kalsiumun sorulmasının artmasına eyni zamanda birincili sidikdən kalsiumun geriyə sovrulmasının artmasına səbəb olmaqla qanda kalsiumun miqdarını artırır.

Estrogenlərin azalması ilə əlaqədar olaraq kalsitonin hormonunun sekresiyasının azalması postmenopauza dövründə osteoklastların aktivləşməsi ilə nəticələnir (17).

Sümükdə olan mineral mübadiləni tənzimləyən elementlərə aid edilən maqnezium insan bədənində ən çox rast gəlinən dördüncü mineraldır. Orqanizmdə olan maqneziumun 60%-ə qədəri sümüklərin tərkibinə daxildir, bu baxımdan sümüklər maqneziumun əsas deposudur (18). Maqneziumun 1%-ə qədərinə qanda sərbəst şəkildə rast gəlinir ki, bu miqdarın sabit saxlanılması qanda gedən proseslərin normal gedişi üçün böyük əhəmiyyət kəsb edir (19). Qanın biokimyəvi analizinə nəzər yetirsək maqneziumun norma daxilində miqdarı 1,6-2,6 mg/dL aralığında olmalıdır. Maqneziumun çatışmazlığı zamanı osteoblastların fəallığı zəifləyir, osteoklastların fəallığı isə artır. Maqneziumun həddindən çox və ya az qəbul edilməsi sümüyün sağlamlığına mənfi təsir göstərir. Bunun üçün sümüyün sağlamlığının qorunmasında maqneziumun qəbulunu nəzarətdə saxlamaq lazımdır (20). Eyni zamanda maqnezium bir çox biokimyəvi reaksiyalarda iştirak edən fermentlərin kofaktoru olmaqla hüceyrə bölünməsində, zülal sintezində, maddələr mübadiləsində, elektrolit tarazlığının qorunmasında iştirak edir.

Sümüyün tamlığının qorunmasında kalsiumun böyük rolu var. Kalsiumun orqanizmdə normal qatılığının tənzimləməsi üçün maqneziuma ehtiyac var. Eyni zamanda həddindən artıq kalsium qəbulu magneziumun işini tormozlayır. Bu səbəbdən orqanizmdə kalsium və maqnezium qəbulunun normal nisbəti daim nəzarətdə saxlanılmalıdır (18). Əgər bu balans pozularsa, kalsiumun artıqlığı orqanizm üçün toksik təsir göstərər, ürək xəstəliklərinə, ateroskleroza, artritə, osteoporoza səbəb olar. Maqneziumun miqdarı sümüyün müxtəlif hissələrində müxtəlif miqdarda olur, belə ki maqneziumun miqdarı qalça sümüyünün qanadının kortikal səthində trabekulyar səthə nisbətən 10-20% daha azdır (19). Beləliklə, osteoporotik sınıqların yaranmasında kalsium və maqnezium çatışmazlığı mühüm əhəmiyyət kəsb edir.

Qanın biokimyəvi analizinə nəzər yetirsək fosforun norma daxilində miqdarı böyüklər üçün 0,81-1,62 mmol/l, uşaqlar üçün isə 1,30-2,26 mmol/l aralığında olmalıdır. Fosfor kalsiumla birlikdə sümüyün inkişafına təsir göstərir, kalsiumdan sonra orqanizmdə ən çox toplanan mineraldır (21). Fosforun funksiyalarına sümüklərin sağlamlığının qorunması, hüceyrə və toxumaların böyüməsi, hüceyrə membranının qurulması, maddələr mübadiləsində enerji ötürülməsi, hormonların tarazlaşdırılması, ATF-in ifrazında iştirak etməyi aid etmək olar (22).

Osteoporoz zamanı risk amillərindən biri də D vitaminidir (Səfərova, 2016: 22). D vitaminin $D_2$ və $D_3$ formaları daha çox bioloji aktivliyə malikdir. D vitamini qeyri-aktiv maddə olub, orqanizmdə bir sıra dəyişikliklərə məruz qalaraq kalsitriola çevrilir. Yaş artdıqca qan zərdabında 1,25 (OH) D səviyyəsinin azalması baş verir ki, bu da sümük metabolizminin sürətlənməsinə səbəb olur (Səfərova, 2016: 22). D vitamininin əsas funksiyası kalsium və fosforun sümüklərdən yuyularaq qanda miqdarının artırılmasından ibarətdir. D vitamini bağırsaqdan kalsiumun və fosforun sorulmasını bu maddələrin sorulmasını təmin edən zülalların sintezini artırmaq yolu ilə gücləndirir. Eyni zamanda D vitamini sümük toxuması hüceyrələri olan osteoklast və osteoblastları aktivləşdirir. Kalsium ATF-azasının sintezi də D vitamininin nəzarəti altındadır (İslamzadə, Əfəndiyev, İslamzadə, 2001: 24). D vitamini kalsium-fosfor mübadiləsində iştirak etməklə yanaşı immun sistemi hüceyrələrinin sintezini, o cümlədən antimikrob peptidlərin də sintezini aktivləşdirir.

Parathormon preproparathormon şəklində qalxanabənzərətrafı vəzidə sintez olunur, peptid strukturludur. 115 aminturşu qalığından ibarət olan preproparathormon ilk olaraq ribosomlardan endoplazmatik şəbəkəyə gətirilir və bu zaman 25 aminturşu qalığından ibarət olan hissəsini itirib proparathormona çevrilir. Holci kompleksində də proparathormondan 6 aminturşu qalığının ayrılması nəticəsində sərbəst parathormon əmələ gəlir (İslamzadə, Əfəndiyev, İslamzadə, 2001: 238).

Parathormonun təsir mexanizmi adenilat-tsiklaza sistemidir. Parathormon kalsium nöqteyi-nəzərdən kalsitriolun sinergistidir, yəni kalsiumun sümüklərdən qana çıxarılmasında iştirak edir. Sümüklərdən kalsiumun itirilməsi onların mineral tərkibinin pozulmasına və nəticədə rezorbsiyası prosesinin sürətlənməsinə səbəb olur. Parathormon fosfor nöqteyi-nəzərdən kalsitriolun antaqonistidir, yəni fosforun qanda miqdarını azaldır, sümüklərdən fosfatların yuyulmasının qarşısını alır. Parathormon böyrək hüceyrələrində adenilat-tsiklazanı fəallaşdırır, xolekalsiferol-1-

hadisə yerinə çatma müddətini artıracaq. Eyni zamanda, qeyd etmək lazımdır ki, hərbi xarakterli FH zamanı karvan şəklində yürüşün təhlükəsizliyini təmin etmək bəzən çətin olur. Buna görə səpələnmiş şəkildə, ara məsafəsinin mümkün qədər çox götürülməsi və FH zonasına müxtəlif yollarla gəlinməsi daha məqsədəuyğundur. Bundan başqa, məsələn, qışda şose yolunun seçilməsi heç də həmişə ən yaxşı həll deyildir (Qaman, Bezlyudko, 2010: 31).

Eynilə, ərazidəki tikililərin, elektrik xətlərinin çəkilməsi, qaz kəmərləri və s. xüsusiyyətlərini nəzərə almaq lazımdır. Asfalt yollar, bir çox amillərdən, o cümlədən fövqəladə hadisələrin inkişafından asılı olaraq nəqliyyatın hərəkəti üçün məhdud dərəcədə istifadə edilə bilər (Qorbunov, 2012: 40).

Bunları nəzərə alaraq, karvandakı bir avtomobilin hərəkət sürəti $v$ yol örtüyü və istifadə olunan texnikadan asılı olacaq. Bu zaman müəyyən sayda yollardan ibarət marşrutun seçilməsi şərti ilə həmin avtomobillə FH zonasına çatma müddətini belə hesablamaq olar:

$$t_{m1} = \sum_{i=1}^{N} \frac{S_i}{v_{1i}} \qquad (5)$$

burada $S_i$ - marşruta daxil olan $i$-ci yol; $v_1$ - bir avtomobilin sürəti.

Yaxud bütün maşın-texnika karvanı üçün marşrutun keçilməsi müddəti aşağıdakı kimi hesablanır:

$$t_m = \sum_{\substack{i=1\\k=1}}^{N,K} \frac{S_{ki}}{v_{ki}} \qquad (6)$$

burada $k$ - karvanda maşınların sayı; $i$ - marşrutda yolların sayıdır.

Beləliklə, QX bölmələrinin FH zonasına çatması müddətini təyin etmək üçün kombinəedilmiş düstur alırıq:

$$T_{çt} = K_1K_2K_3K_4 + t_m \text{ və ya } T_{çt} = K_1K_2K_3K_4 + \sum_{\substack{i=1\\k=1}}^{N,K} \frac{S_{ki}}{v_{ki}} \qquad (7)$$

Bu düsturun vasitəsi ilə fövqəladə hal zonasına xilasetmə bölmələrinin çatma vaxtı və bütün təs edəbiləcək amillər nəzərə alınmaqla hesablana bilər. Müasir dövrdə ehtimal olunan düşmən tərəfindən böyük dağıdıcı gücə malik nüvə silahı və digər yeni kütləvi qırğın vasitələrinin tətbiqi məsələləri daima aktualdır (Qraçev, 2003: 232). Bunun nəticəsində geniş zədələnmə ocaqları, dağıntılar və çoxlu sayda insan tələfatına gətirib çıxaran fövqəladə hadisələr baş verə bilər. Kütləvi qırğın silahları tətbiq edilən hadisələri tam şəkildə qiymətləndirmək mümkün deyil, lakin onları səmərəli şəkildə idarə etmək olar (Puçkova, 2016: 377). Bu tip fövqəladə hadisələr zamanı başlıca məqsəd xilasetmə işləri yerinə yetirən şəxsi heyətə, ətraf mühitə və əhaliyə təsir edən təhlükəli amilləri çevik şəkildə aradan qaldırılması və risk dərəcəsini azaltmaqdan ibarətdir.

## Nəticə

Qəza-xilasetmə bölmələrinin hərbi xarakterli FH zonasına çatmasına təsir edən amillər müəyyən olunmuş, bu müddətin hesablanması üçün metodika işlənmişdir.

Zədələnmə ocaqlarında qəza-xilasetmə və digər təxirəsalınmaz işlərin təşkilinə dair tədbirlər dinc dövrdə planlaşdırılmalı və hazırlanmalıdır. Düşmən hücum etdikdən sonra isə onlar dəqiqləşdirilir və yaranmış vəziyyət nəzərə alınmaqla həyata keçirilir.

Çatma vaxtının dəqiq hesablanılması üçün şəraitin proqnozlaşdırılması və qiymətləndirilməsi hücuma qədər, eləcə də sonradan kəşfiyyatın verdiyi məlumatlar əsasında onları dəqiqləşdirməklə, yəni düşmənin kütləvi qırğın vasitələrini faktiki tətbiq etməsi barədə ilkin məlumatlara əsaslanaraq aparılır.

Düşmən hücum edənə qədər proqnozlaşdırma müasir silahların dağıdıcı amilləri, yerli şəraitlərin və QX bölmələrinin imkanlarının xüsusiyyətləri nəzərə alın-maqla yerinə yetirilir.

Bu xüsusiyyətlərə, aiddir: fiziki-coğrafi, meteoroloji və sanitar-epidemioloji; insan və qiymətli materiallar resursları; nəqliyyat, rabitə və tikililərin vəziyyəti; zədələndikdə və dağıldıqda partlayışlar, yanğınlar, subasmalar və s. nəticə-sində ikinci dağılma mənbələri yaratma ehtimalı olan

iqtisadi obyektlərin mövcudluğu. Beləliklə, fövqəladə hallarln və nəticələrinin aradan qaldırılması zamanı xilasetmə bölmələrinin zədələnmə ocağına çatma vaxtının əvvəlcədən hesablanması və ehtimal edilən təsir amillərinin müəyyən edilməsi bilavasitə xilasetmə işlərinin müvəffəqiyyətlə həyata keçməsinə təsir edir.

## Ədəbiyyat


1. "Azərbaycan Respublikasının Mülki müdafiəsi haqqında Əsasnamə". 1992-ci il.
2. "Azərbaycan Respublikasının Fövqəladə Hallar Nazirliyi haqqında Əsasnamə". 2006-cı il.
3. "Azərbaycan Respublikasında sülh və müharibə dövrlərində fövqəladə hadisələrdə əhalini mühafizənin əsas prinsipləri haqqında". 1992-ci il.
4. Ocaqov, H. (2011). Fövqəladə halların idarə olunması. Bakı: Təhsil, 231 s.
5. Ocaqov, H. (2002). Həyat fəaliyyətinin təhlükəsizliyinin əsasları. Bakı: Şirvannəşr, 150 s.
6. Sadıq-zadə, Ü. (2022). Qəza-xilasetmə hazırlığı. Bakı: Təhsil, 105 s.
7. Sadiq-zadə, Ü. (2021). Təcili xilasetmə və digər təxirəsalınmaz işlərin idarəedilməsi. XVI Beynəlxalq Elmi-Praktik Konfransın materialları toplusu, 375-380 s.
8. Gorishniy, V., Chernesov, B. (2002). Bezopastnost zhiznedeytelnosti. Moskva, 164 s.
9. Gaman, M., Bezlyudko, A. (2010). Osnovniye polozheniya po organizacyy tekhniceskogo obespeceniya. Minsk, 31 s.
10. Gorbunov, S. (2012). Bezopastnost spasatelnikh rabot. Khimki, 40 s.
11. Grachev, A. (2003). Sredstva individualnoy zashiti. Moskva, 232 s.
12. Puchkova, A. (2016). Grazhdanskaya oborona. Moskva, 377 s.


Göndərilib: 08.09.2023 Qəbul edilib: 03.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/39-44

**Günay Dadaşzadə**
Azərbaycan dövlət Pedaqoji Kolleci
gunay_dadaszade@mail.ru

# ELEMENTAR ZƏRRƏCİKLƏRİN QARŞILIQLI TƏSİRİNİN TƏDQİQİ

**Xülasə**

Elementar zərrəciklərin müxtəlif nəzəriyyələri mövcuddur, baxmayaraq ki, hələ də vahid tam nəzəriyyə yoxdur. Bu məqalədə elementar zərrəciklərin qarşılıqlı təsirinin əsas anlayışları, növləri və mexanizmləri nəzərdən keçirilmişdir. Protonların daxili quruluşunun öyrənilməsi elementar zərrəciklər fizikasının aktual məsələlərindən biridir. Məqalədə protonların müxtəlif tip qarşılıqlı təsirinə nəzəri olaraq baxılmışdır. Bəzi enerjilərdə zərrəciklərin qarşılıqlı təsirinin nəticələri qrafiki olaraq təsvir edilmişdir. Nəzəri hesablamaların eksperimentlərlə yoxlanılması da böyük əhəmiyyət daşıyan məsələlərdəndir.

***Açar sözlər:*** *enerji, zərrəcik, kvark, atom, nüvə*

**Gunay Dadashzadeh**
Azerbaijan State Pedagogical College
gunay_dadaszade@mail.ru

## Study of interactions of elementary particles

**Abstract**

There are various theories of elementary particles, although there is still no single complete theory. The main concepts, types and mechanisms of the interaction of elementary particles were considered in this article. The study of the internal structure of protons is one of the topical issues of elementary particles physics. The article considers the different types of interactions between of protons. The results of the interaction of particles in some energies are graphically described. Experimental verification of theoretical calculations is also of great importance.

***Keywords:*** *energy, particle, quark, atom, nucleus*

## Giriş

Maddə quruluşunun öyrənilməsi zamanı məlum olmuşdur, ki atomlar proton və neytronlardan təşkil olunmuşdur.Bunu təyin etmək elə də çətin olmamışdır - zərrəciyi lazımi enerjiyə çatdırdıqda onlar öz "tərkib hissələrinə" parçalanmışdılar. Lakin proton və neytronlarla bunu etmək mümkün olmamışdır.Onların bölünməz zərrəcik olmamasına baxmayaraq heç bir güclü qarşılıqlı təsirdə "hissələrinə" ayırmaq mümkün olmamışdır. Buna görə də protonların daxilini müşahidə edib onların quruluş və formasını görmək üçün müxtəlif üsullar fikirləşməyə fiziklərə onilliklər lazım olmuşdur (Trofimova, 1998: 478*)*. Hazırda protonun struktrunun öyrənilməsi-elementar zərəciklər fizikasının aktiv sahələrindən biridir.Elementar zərrəciklər daxili quruluşu digər zərrəciklərin birləşməsi kimi təqdim edilə bilməyən hissəciklərdir. Zərrəciklər bir-birinə çevrilə, müxtəlif reaksiyalara girə və başqa elementar hissəcikləri əmələ gətirə bilər (Trofimova, 1996: 304). Təcrübədə müşahidə edilən ilk elementar hissəcik elektron olmuşdur və on doqquzuncu əsrdə katod şüalarının bir hissəsi kimi kəşf edilmişdir. XX əsrin əvvəllərində proton, daha sonra isə neytron və pozitron kəşf edildi. Nüvə fizikasının inkişafı ilə elementar zərrəciklərin sayı kəskin şəkildə artdı və indi yüzlərlədir. Demək olar ki, bütün elementar zərrəciklər üçün yük və maqnit momentinin əks qiymətlərinə malik olan antihissəciklər var. Zərrəcik və antihissəcik qarşılaşdıqda, onlar məhv olurlar, yəni Eynşteynin $E=mc^2$ düsturuna uyğun olaraq, zərrəciklərin sükunət kütləsi ilə əlaqəli enerjisi şüalanma enerjisinə çevrilir (Volkenshtein, 1999: 328).

Hadronların tərkib hissələrinin öyrənilməsi sahəsində ən iri, inqilabi və sonralar aydın olduğu kimi, ən həlledici addım 1964-cu ildə Amerika alimləri M.Gell-Mann və C.Sveyq tərəfindən atılmışdır. Onların ideyasına əsasən, butun hadronlar cəmi uç yeni, indiyə qədər məlum olmayan qeyri-adi zərrəcikdən və onların antilərindən qurulmuşlar (Trofimova, 1999:592). Bu qeyri-adi fundametal obyektləri Gell-Mann ≪kvark≫lar, C.Sveyq isə ≪tuz≫lar adlandırmışdı. Sonralar Gell-Mannın qoyduğu ad yaşamışdır. Həmin kvarklar latın əlifbasının *u, d* və *s* həriflərilə (ingiliscə, uyğun olaraq, ≪yuxarı≫, ≪aşağı≫ və ≪qəribə≫ mənalarını verən **up, down** və **strange** sozlərinin ilk həriflərilə) işarə edilir. Sonralar elmə daha uç növ kvark daxil edilmişdir: *c* -kvark, *b* - kvark və *t* -kvark (ingiliscə charm-fusunkar, beauty (yaxud bottom) – gozəl (yaxud alt), truth (yaxud top)- əsil (yaxud ust) sozlərindən). Kvarkların novlərini cox vaxt **kvarkın rayihələri** adlandırırlar. Cədvəl 1-də kvarkların xarakteristikaları göstərilmişdir (Volkenstein, 1999: 588*)*.

Beləliklə, hadronların kvark qurulusu kəşf olunduqdan sonra məlum olmuşdur ki, kvarkların bir neçə növü olur və onlardan bir çox müxtəlif növ zərrəciklər konstruksiya oluna bilər.Buna görə də bir-birinin ardınca yeni hadronların tapılması artıq heç kəsi təəccübləndirmir.Hadronların kütləsi heç də kvarkların kütlələri cəmindən ibarət deyil.Kvarkların öz kütləsi- yalnız iki faiz protonların kütləsindən asılıdır, bütün qalan ağırlıq isə kvarkları birlikdə saxlayan qüvvə sahəsi hesabına meydana gəlir (Krasilnikov, 2002: 29).

Protonların daxilində enerji sanki ayrı-ayrı kompakt sahələrdə konsentrə olunmuşdur ki, bunları da məhşur fizik Riçard Feynman tərəfindən parton adlandırmaq təklif olunmuşdur.

Yüklü partonlar-kvarklar, neytral partonlar isə qlüonlardır.Təcrübələr göstərmişdir ki, enerjinin yarısı kvarklarda, yarısı isə qlüonlarda cəmlənir.

Partonları ən yaxşı halda elektronlarla toqquşmada öyrənmək əlverişlidir (Suprun, 2004: 54). Məsələ ondadır ki, protonlardan fərqli olaraq elektronlar güclü qarşılıqlı təsirlərdə iştirak etmirlər və onun protonla toqquşması çox sadə görünür-elektron çox qısa müddətdə virtual foton şüalandırır, yüklü partonlara bölünür və sonunda böyük sayda zərrəciklər yaradır (şəkil 1).




**Şəkil 1. Protonun elektronla toqquşması**

Demək olar ki, elektron, protonun ayrı-ayrı hissələrə qısa müddətə də olsa bölünməsində böyük rol oynayır (8). Sürətləndiricidə belə proseslərin başvermə tezliyini bilməklə protonun daxilindəki partonların sayını və yükünü təyin etmək olar.Lakin elementar zərrəciklərin tərkibi, əgər onlar işıq sürətinə yaxın sürətlə hərəkət edirlərsə, nisbi anlayışdır (Platonova, Kukulin, 2010: 281).

**Cədvəl 1. Kvarklar barədə məlumat**

| İşarəsi | Adı ingiliscə (azərb.) | Kütlə (MeV) | $J^P$ | Q | B | S | C | b | t | T | $T_3$ |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| u | up (yuxarı) | 1,5-3,0 | $1/2^+$ | +2/3 | 1/3 | 0 | 0 | 0 | 0 | 1/2 | 1/2 |
| d | down (aşağı) | 3-7 | $1/2^+$ | −1/3 | 1/3 | 0 | 0 | 0 | 0 | 1/2 | −1/2 |
| s | strange (qəribə) | 95 | $1/2^+$ | −1/3 | 1/3 | −1 | 0 | 0 | 0 | 0 | 0 |
| c | carm (füsunkar) | $1{,}25\cdot10^3$ | $1/2^+$ | +2/3 | 1/3 | 0 | +1 | 0 | 0 | 0 | 0 |
| b | beauty (gözəl) bottom (alt) | $4{,}20\cdot10^3$ | $1/2^+$ | −1/3 | 1/3 | 0 | 0 | −1 | 0 | 0 | 0 |
| t | truth (həqiqi) top (üst) | $172{,}5\cdot10^3$ | $1/2^+$ | +2/3 | 1/3 | 0 | 0 | 0 | +1 | 0 | 0 |

Güclü LHC (Large Hadron Collider-güclü adron sürətləndiricisi) maşını (şəkil 1) milyardlarla protonların digər milyardlarla protonla toqquşmasını təmin edir və bu toqquşmanı sürətləndirir. Bu işin əsas məqsədi təbiəti başa düşmək üçün olan əsas suallara cavab verməkdir. Qarşılıqlı təsirin digər xarakteristikası yüklü $n_{ch}$ zərrəciklər çoxluğunun verilmiş faza həcmində hadisələrin paylanmasıdır (şəkil 2).




**Şəkil2. Yüklü zərrəciklər çoxluğunun verilmiş faza həcmində hadisələrin paylanması**

Paylanmadan görünür ki, $p_T > 100$ MeV /s olduqda hadisələrdə yüklü zərrəciklər çoxluğu 200-ə çatır, $p_T > 500$ MeV /s olduqda isə 120 olur. 60 zərrəcik çoxluğundan başlayaraq eksperimental göstəricilər generatorun proqnozunu aşır. Eksperimental verilənlərə ən uyğun generator ATLAS-dır (şəkil 3).




**Şəkil 3. Atlas detektorunun sxemi**

Bəs protonlar toqquşanda nə baş verir? Proton mürəkkəb zərrəcikdir, o qlüon sahəsi ilə bir-birilə bağlanmış 3 kvarkdan ibarətdir (+2/3 elektrik yüklü iki u-kvarkdan və –1/3 yüklü bir d-kvarkdan ). Əgər proton işıq sürətinə yaxın sürətlə hərəkətdədirsə, o zaman qlüon sahəsi sadəcə bağlayıcı qüvvə olmur və kvarklarla birlikdə hərəkət edən -qlüon-zərrəciklər seli kimi maddiləşir. Hesab etmək olar ki, tez uçan proton bir-birinə qarışmış qlüon, kvark, antikvark "dumanından" ibarətdir. İki proton qarşı-qarşıya toqquşduqda o demək deyil ki, hər bir parton qarşıdakı protonun daxilindəki nə iləsə toqquşur.Adətən daha sadə hal baş verir: bir protondan bir kvark digər qarşıdakı protonun hansısa bir hissəsi ilə toqquşur, digər partonlar isə yan keçirlər (Platonova, Kukulin, 2010: 282).

Bir qayda olaraq, partona zərbə eninə deyil, uzununa baş verir. Nəticədə, əsasən, hadronlar böyük uzununa, kiçik eninə impulsla yaranırlar.Buna görə də tipik proton-proton toqquşması təxminən şəkil 4-dəki kimi görünür.




**Şəkil 4. Hadronlar çoxluğunun yaranmasının prosesi sxematik təsviri**

Böyük enerjilərlə proton toqquşanda,toqquşduqda yeni yaranan hissəciklər orjinal toqquşan hissələrdən daha ağır olur və bu $E=mc^2$ əsasında olur.Toqquşmaya daxil edilən bütün enerji kütlə ilə əvəz oluna bilər (Platonova,2011:55). Beləliklə proton-proton toqquşmasında enerji və momentin saxlanması kimi əsas prinsiplərə riayət olunmaqla "hər şey" ola bilər (şəkil5).

TƏBİƏT VƏ ELM Beynəlxalq elmi jurnal. 2023 / Cild: 5 Sayı: 11 / 39-44 ISSN: 2707-1146
NATURE AND SCIENCE International scientific journal. 2023 / Volume: 5 Issue: 11 / 39-44 e-ISSN: 2709-4189




**Şəkil 5. Protonla-protonun toqquşmasının təsviri**

Güclu qarşılıqlı təsirin elementar aktı-rəngli kvarkın qlüon buraxması və udmasıdır (şəkil 6). Rəngli qluonu buraxdıqda və ya udduqda kvark oz (şəkil 4) rəngini dəyişir, rayihəsi isə əvvəlki kimi qalır.




**Şəkil 6. Kvarkın qlüon buraxması və udmasının sxematik təsviri**

Hal-hazırda dörd növ fiziki qarşılıqlı təsir məlumdur, onları fundamental adlandırmaq olar: 1) qravitasiya, 2) zəif, 3) elektromaqnit, 4) güclü (nüvə).

Bu qarşılıqlı təsirlər daha sadə olanlara bölünə bilməz. Qarşılıqlı təsirlərin özləri elementar zərrəciklərdən istifadə edilməklə həyata keçirilir. $F = q_1q_2/\ 4\pi\varepsilon_0 r^2$ Kulon düsturunda uzuna təsir prinsipindən və ya siqnalın ani yayılma sürətindən istifadə edilir. Bu düstur stasionar və ya yavaş hərəkət edən yüklər üçün doğudur, o zaman ki, onlar arasında siqnal mübadiləsi zamanı hissəciklər arasındakı məsafənin dəyişməsini nəzərə almamaq olar. İşığın sonlu sürətini nəzərə almaq nöqtəvi yüklərin qarşılıqlı təsiri üçün düsturları əhəmiyyətli dərəcədə çətinləşdirir. Müasir fizika baxımından elektrik yüklərinin qarşılıqlı təsir mexanizmi necədir? Kvant elektrodinamikası çərçivəsində göstərilir ki, elektrik yükləri arasında qarşılıqlı təsir elektromaqnit təsirinin daşıyıcısı olan fotonların mübadiləsi yolu ilə həyata keçirilir. Yüklərdən birinin yaxınlığında başqa bir yüklə udulmuş virtual fotonlar yaranır. Bu virtual fotonlarla yüklərin mübadiləsi qarşılıqlı təsir qüvvəsinin yaranmasına səbəb olur. Yada salaq ki, virtual hissəciklər çox qısa müddət ərzində mövcud ola bilən, onların eksperimental müşahidəsi üçün yetərli olmayan hissəciklərdir. Virtual hissəciklərin mövcudluğu onların digər hissəciklərə təsirinin nəticələri ilə təsdiqlənir. Virtual hissəciklərin yaranması saxlanma qanunlarının, məsələn, enerjinin saxlanması qanununun pozulması ilə baş verə bilər. Bu pozuntuların izahı Heisenbergin qeyri-müəyyənlik prinsipi nəzərə alınmaqla verilir. Eynilə, digər qarşılıqlı təsir növləri bu qarşılıqlı əlaqəni təyin edən müvafiq mənbələr arasında elementar hissəciklərin mübadiləsi yolu ilə həyata keçirilir. Çox vaxt virtual hissəciklərin - qarşılıqlı təsir daşıyıcılarının mövcudluğu əvvəlcə nəzəri olaraq proqnozlaşdırılır, sonra isə bu hissəciklər eksperimental olaraq müəyyən edilir (*Kukulin, Platonova, 2012:31*).

## Nəticə

Kvark modeli sayəsində bir sıra yeni elementar hissəcikləri proqnozlaşdırmaq və sonra kəşf etmək mümkün oldu. Kvarkların və fraksiya elektrik yüklərinin özləri hələ etibarlı şəkildə müşahidə edilməmişdir, lakin bəzi təcrübələrdə kvarkların və fraksiya elektrik yüklərinin müşahidə edildiyi görünür. Kvarklar arasında qarşılıqlı əlaqə xüsusi hissəciklərin - qluonların mübadiləsi yolu ilə həyata keçirilir. Rəngi bir kvarkdan digərinə keçirərək kvarkların bir yerdə saxlanmasına səbəb *olurlar*. *Həm* kvarklar nəzəriyyəsinin özü, həm də elementar hissəciklərin daha ümumi nəzəriyyəsi tədqiqat və inkişaf mərhələsindədir.

## Ədəbiyyat

1. Trofimova, T.İ. (1998). Fizika kursu. M.: Ali məktəb, 478 s.
2. Trofimova, T.İ. (1996). Fizika kursu üçün problemlər toplusu. M.: Ali məktəb, 304 s.
3. Volkenshtein, V.S. (1999). Fizikanın ümumi kursu üçün problemlər toplusu. Sankt-Peterburq: "Xüsusi ədəbiyyat", 328 s.
4. Trofimova, T.İ., Pavlova, Z.G. (1999). Həlli ilə fizika kursu üçün problemlər toplusu. M.: Ali məktəb, 592 s.
5. Volkenstein, V.S. (1999). "Ümumi fizika kursu üçün məsələlər toplusu"nun bütün həlləri. M.: Ast, 588 s.
6. Krasilnikov, O.M. (2002). Fizika. Müşahidə nəticələrinin işlənməsi üçün metodiki göstərişlər. M.: MISIS, 29 s.
7. Suprun, İ.T., Abramova, S.S. (2004). Fizika. Laboratoriya işlərinin yerinə yetirilməsi üçün təlimatlar, Elektrostal: EPI MISiS, 54 s.
8. https://elementy.ru/trefil/46/Elementarnye_chastitsy
9. Platonova, M.N., Kukulin, V.I. (2010). Spin observables in proton-induced deuteron breakup within the refined Glauber model. Book of Abstracts of LX International Conference "NUCLEUS 2010". St. Petersburg: SPbGU, 281 p.
10. Platonova, M.N., Kukulin, V.I. (2010). Reconstruction of nn and np helicity amplitudes from Nd experimental data at intermediate energies. Book of Abstracts of LX International Conference "NUCLEUS 2010". St.Petersburg: SPbGU, 282 p.
11. Platonova, M.N. (2011). Quark degrees of freedom in the deuteron and their testing in nucleon-deuteron scattering. Book of abstracts of the Rutherford Centennial Conference on Nuclear Physics, Manchester, UK, Bristol: IOP Publishing, 55 p.
12. Kukulin, V.I., Platonova, M.N. (2012). Short-range components of nuclear forces: experiment versus mythology. Book of Abstracts of LXII International Conference "NUCLEUS 2012", Voronezh, St. Petersburg: SPbGU, p. 31.

Göndərilib: 11.08.2023 Qəbul edilib: 03.11.2023

## BİOLOGİYA VƏ AQRAR ELMLƏR

## BIOLOGICAL AND AGRARIAN SCIENCES

DOI: https://doi.org/10.36719/2707-1146/38/45-51

**Samirə Bağırova**
Dendrologiya Bağı Publik Hüquqi Şəxs
biologiya üzrə fəlsəfə doktoru
samira.baqirova.2013@mail.ru
**Səxavət Rüstəmov**
Azərbaycan Respublikası Elm Təhsil Nazirliyi
Təcrübə-Sənaye Zavodu
kimya üzrə fəlsəfə doktoru
sakhavat.rustamov@gmail.com
**Leyla Atayeva**
Dendrologiya Bağı Publik Hüquqi Şəxs
magistrant
atayeva-2019@mail.ru
**Şəbnəm Əşrəfova**
Dendrologiya Bağı Publik Hüquqi Şəxs
magistrant
shabnam_ashrafova@mail.ru

# *PİNUS* L. CİNSİNƏ AİD NÖVLƏRDƏ "BAĞ MƏLHƏMİ" PREPARATININ İSTİFADƏ PERSPEKTİVLİYİ

**Xülasə**

Qlobal miqyasda artan antropogen təsirlər və kəskin iqlim dəyişikliklərinin intensivliyi təbii ekosistemlərin deqradasiyasına səbəb olmuşdur. Respublikamızda yaşıllaşdırmada yeni növlərin tətbiqi, iqlim dəyişkənlikləri və ekoloji tarazlığın pozulması ilə əlaqədar olaraq yeni innovaziv bitki xəstəliklərinin yayılması sürətlənmişdir. Patogenlərə qarşı ilkin profilaktik tədbir olaraq budama işinin düzgün aparılması vacib şərtlərdəndir. Yalnış aparılan budama prosesi yara yerlərində çürüməyə, xəstəlik və çatların əmələ gəlməsinə səbəb olur ki, bu da mikroorqanizm və göbələklərin daxil olmasına şərait yaradır. Bu səbəbdən budama yerlərinə xüsusi məlhəmlərin tətbiq edilməsi mütləqdir. Təcrübə-Sənaye Zavodu MMC tərəfindən istehsal olunmuş "Bağ Məlhəmi" preparatının "Dendrologiya Bağı" publik hüquqi şəxsin ərazisində tətbiqi prespektivliyinin laborator və stasionar şəkildə araşdırılması məqalənin əsas məqsədi olmuşdur. Laborator şəraitdə sınaqdan keçirilmiş "Bağ məlhəmi" preparatı "Dendrologiya Bağı" ərazisində *Pinus eldarica* Medw. və *Pinus halepensis* Mill. növlərinə budanmadan sonra tətbiq edilmiş və növlərin üzərində dendroxronoloji tədqiqatlar aparılmış, müsbət nəticələr əldə olunmuşdur.

***Açar sözlər:*** *bağ məlhəmi, Pinus L., Pinus eldarica Medw., Pinus halepensis Mill., budama, dendroklimotologiya, dendroxronologiya*

**Samira Baghirova**
Dendrology Garden Public Legal Entity
PhD in biology
samira.baqirova.2013@mail.ru
**Sakhavat Rustamov**
Ministry of Science and Education of the Republic of Azerbaijan
Experience-Industrial Plant
PhD in chemistry
sakhavat.rustamov@gmail.com

**Leyla Atayeva**
Dendrology Garden Public Legal Entity
master student
atayeva-2019@mail.ru
**Shabnam Ashrafova**
Dendrology Garden Public Legal Entity
master student
shabnam_ashrafova@mail.ru

## Perspectives of the use of "garden ointment" for species belonging to genus of *Pinus L.*

### Abstract

Increasing anthropogenic impacts and the intensity of drastic climate changes on a global scale have led to the degradation of natural ecosystems. The spread of new innovative plant diseases has accelerated due to the introduction of new species in greening in our republic, climate changes and disruption of the ecological balance. As a primary preventive measure against pathogens, proper pruning is one of the important conditions. Improper pruning causes rotting, disease, and cracks in wound areas, which allow microorganisms and fungi to enter. For this reason, it is necessary to apply special ointments to the pruning sites. The main goal of the article was to investigate the feasibility of using the "Garden Ointment" preparation produced by the Experimental-Industrial Plant LLC in the territory of the public legal entity "Dendrology Garden" in a laboratory and stationary manner. The "Garden Ointment" project won the "Main Grant Competition - 2022" grant of the "Science Development Fund". "Garden Ointment" preparation tested in laboratory conditions in "Garden of Dendrology" *Pinus eldarica* Medw. and *Pinus halepensis* Mill. were applied to the species after pruning and dendrochronological studies were conducted on the species, positive results were obtained.

***Keywords:*** *garden salve, Pinus L., Pinus eldarica Medw., Pinus halepensis Mill., pruning, dendroclimatology, dendrochronology*

### Giriş

Budama prosesi meşə ekosistemində təbii halda və suni şəkildə isə insan tərəfindən aparılır. Meşələrdə işıq şüasının az düşdüyü budaqlar quruyur və gövdədən ayrılır. Bu proses “təbii budama” və ya “təbii gövdə təmizliyi” adlanır. Suni budamanın bir çox üstün cəhətləri olduğu kimi cavan budaqları kəsərkən diqqət tələb edir. Bəzi növlərin kəsim yerləri tez bərpa olunduğu halda, əksəriyyət növlərdə isə gec bərpa olunur (Mammadov, 2016: 278). Əksər növlərin budanması üçün ən uyğun vaxt payız və ya erkən yazdır. Xüsusilə, yarpaqlarını tökən ağaclar gec budanmalıdır. Budama zamanı yaranan yara yerlərinə məlhəm tətbiq edilməsi vacibdir. Məlumdur ki, ağac toxuması özünü bərpa etmək qabiliyyətinə malikdir (Fritts, 1976: 22). Diametri 2-2,5 sm-dən çox olmayan kiçik yaralar nisbətən tez sağalırsa, dərin yaralar xüsusi diqqət tələb edir. Məlhəm kəsilmiş yerləri yandırmayan, qurutmayan, yoğrulan, soyuğun təsirindən əriməyən, tərkibi zərərsiz olmalıdır (Garcia, 2012: 57). Yaz ayları bitkilər üçün ən həssas dövr olduğundan bağ məlhəminin sınaqdan keçirilməsi tərəfimizdən bu dövrdə daha intensiv aparılmışdır (şək.1.). Yaz aylarında bitkilərdə hər hansı bir çatlamış yaradan şirə axını müşahidə olunur ki, bu da zərərvericiləri cəlb edir və çürümə prosesinə şərait yaradır. AR ETN Təcrübə-Sənaye Zavodu MMC tərəfindən istehsal edilmiş “Bağ Məlhəmi” budama və peyvənddən sonra dekorativ və meyvə ağaclarında yaranan zədələrin sterilizasiyası və sağaldılması üçün preparatdır (4, 5). Bu məqsədlə zavodun elmi-tədqiqat sınaq laboratoriyası tərəfindən bir neçə nümunə hazırlanmış, bu nümunələrdən biri yüksək effektivlik nümayiş etdirmişdir. Belə ki, təqdim olunan təcrübə nümunələri 1 hektar ərazidə sınaqdan keçirilib və müsbət nəticələr əldə olunub. Həmçinin, “Bağ məlhəmi”-nin istehsalı zamanı yerli xammaldan istifadə edilməsi və məhsulun hazırlanması zamanı az itki (2%) əldə edilməsi iqtisadi və ekoloji

cəhətdən təmmiz məhsul olduğunu sübut edir (6), (AEF-MCG-2022-1(42)-12/08/3-M-08 Elmin İnkişafı Fondu layihə nömrəsi).

Bağ məlhəmi budanmış kəsik yerlərinə rütubətin daxil olması səbəbindən gövdə çürüməsinin, gəmiricilər tərəfindən, şaxtadan, günəş yanığından zədələnmələrin və patogen orqanizmlərin daxil olmasının qarşısını alır. Məlhəm gövdə qabığında “süni qabıq" effekti yaradır, regenerasiya prosesini sürətləndirmək üçün istifadə olunur. T-46 turbin yağı, parafin, polietilen, polimer Lubimax 181-TDS materialından hazırlanmış məlhəm kəsilmiş yerləri yandırmayan, qurutmayan, yoğrulan həmçinin, soyuğun təsirindən ərimƏyəndir. 1 ton məlhəmin hazırlanması üçün 670.0 kg T-46 turbin yağı, 250.0 kg parafin, 50.0 kg polietilen, 50.0 kg polimer Lubimax 181-TDS istifadə olunmuşdur. Məhsulun hazırlanması zamanı temperatur 100$^{o}$C qədər yüksəldilərək bərk material əridilmiş və 0,5 saat qarışdırılmışdır. Növbəti 4 saat ərazində temperatur 60$^{o}$C-yə qədər soyudulmuş və hazır məhsul boşaldılmışdır. 1020.0 kq qarışıq materialdan 1000.0 kq bağ məlhəmi, 20.0 kq isə qalıq məhsul əldə edilmişdir. İstifadəyə tam hazır məhsul əvvəlcədən isitmə tələb etmir, +4°C temperaturda istifadə oluna bilər. Şaxta və yağışlı günlər istisna olmaqla, il ərzində istifadə edilə bilər, çünki su yeni tətbiq olunan qoruyucu təbəqəyə zərər verə bilər. Effektivliyi artırmaq üçün bandajla qapadılması tövsiyə olunur (cəd.1.).

**Cədvəl 1.**
**Bağ məlhəmi preparatının hazırlandığı materiallar**

| № | Adı | Miqdarı | |
|---|---|---|---|
| | | % | Kq |
| *Götürülmüşdür:* | | | |
| 1. | T-46 turbin yağı | 65,2 | 670,0 |
| 2. | Parafin | 24,8 | 250,0 |
| 3. | Polietilen | 5,0 | 50,0 |
| 4. | Polimer Lubimax 181-TDS | 5,0 | 50,0 |
| Cəmi | | 100,0 | 1020,0 |
| *Alınmışdır:* | | | |
| 1. | Bağ məlhəmi | 98,0 | 10,0 |
| 2. | İtki | 2,0 | 20,0 |
| Cəmi | | 100,0 | 1020,0 |

AR ETN Təcrübə-Sənaye Zavodu MMC tərəfindən istehsal edilmiş məlhəm Dendrologiya bağı ərazisində sentyabr ayına uyğun olaraq qeydə alınmış orta aylıq temperatur (23.6$^{o}$C) və rütubət (66%) nəzərə alınmaqla *Pinaceae* Lindl. (Şamkimilər) fəsiləsinin *Pinus* L. (Şam) cinsinin *Pinus eldarica* Medw. (Eldar şamı), *Pinus halepensis* Mill. (Hələb şamı) növlərinin budanmış və açıq yara yerlərinə ətbiq edilmişdir (7). “Bağ məlhəmi” preparatının budama işi aparılmış növlər üzərində təsir mexanizmlərinin izlənilməsi məqsədi ilə Dendrologiya Bağının Dendroxronologiya laboratoriyası *Pinus eldarica* Medw. və *Pinus halepensis* Mill. növlərinin yaşlı nüsxələrdən Suunto burğusu vasitəsi ilə şaquli sahəyə perpendikulyar olaraq hər iki ağacdan 4-5 nümunə götürülmüş, konteynerə yerləşdirilmişdir (Cook, 1990: 166). Nümunələrin çıxarılması zamanı yaranan açıq yara yerlərinə məlhəm tətbiq edilmiş, əldə edilmiş nümunələr laboratoriya şəraitində qurudulmuşdur (Vaqanov, 1978: 103). İllik halqaların sərhədlərinin aydın görünməsi üçün nümunələr yonularaq dendroxronoloji tədqiqə hazırlanmışdır (Bagirova, 2020: 21).

TƏBİƏT VƏ ELM Beynəlxalq elmi jurnal. 2023 / Cild: 5 Sayı: 11 / 45-51 ISSN: 2707-1146
NATURE AND SCIENCE International scientific journal. 2023 / Volume: 5 Issue: 11 / 45-51 e-ISSN: 2709-4189




**Şəkil 1. “Bağ məlhəmi” preparatı və istifadəsi**

Ağacların böyüməsi üçün əlverişli ərazilərdə geniş illik halqalar əmələ gəlir. Ağacların radial artımı ətraf mühitin dəyişkənliylərini özündə əks etdirir. Əlverişsiz şərait zamanı halqalar arası məsafə daralır, bu da növlərə öz təsirini əhəmiyyətli dərəcədə göstərir. Antropogen təsirlərin artması və iqlim dəyişiklikləri təbii ekosistemlərin ciddi deqradasiyasına səbəb olmuşdur. LİNTAB 6 binokulyar mikroskopdan və TSAPwin statistik illik halqaların təhlili proqramından istifadə etməklə növlərin populyasiyalarında baş verən proseslərin biometrik analizi, eləcə də növlərin mühafizəsi məqsədi ilə tədqiqatlar icra edilmişdir (Schweingruber, 1996: 609). Halqalar üzərindəki məlumatlarının oxunması *Schweingruber* metodikası əsasında aparılmışdır (Rinn, 1996: 246). Binokulyar mikroskopla alınmış illik halqaların eni ölçü şkalasına uyğun olaraq, LİNTAB 6 qurğusu ilə 0,01 mm dəqiqliklə ölçülmüşdür (şək. 2) (Şiyatov, 2000: 80). Mikroskop altında halqaların təyinində Cook-Kairiukstisin üsulundan, yalançı və itmiş halqaların aşkar edilməsində F.Rinin tətbiq etdiyi TSAPwin proqramından istifadə edilmişdir (Bagirova, 2019: 25).

Şam cinsinin *Pinus eldarica* Medw. - Eldar şamı Azərbaycanın endemik və relikt növüdür. *Pinus eldarica* Medw. təbii halda hündürlüyü 20 m-ə qədər olan ağacdır (Qurbanov, 2009: 131). Gövdəsinin diametri 40 sm-dək olub, bozumtul-qonur rəngdə, qeyri-bərabər çatlıdır. İynəyarpaqların uzunluğu 12-15 sm-ə qədər olub, göy rəngdədir, kənarları narın dişlidir, ucları azca sivriləşmişdir. Aprel və may aylarında külək vasitəsilə tozlanır, toxumla çoxalır. Yetişmiş qozaları yumurtavari-uzunsov və ya yumurtavari-konusşəkillidir, rəngi bozumtul-qonur və ya qonurumtul-qəhvəyi rəngdədir. Quraqlığa, istiyə, soyuğa davamlıdır, şoranlığa, küləyə dözümlü və torpağa tələbkar olmayan şam növüdür.Dendrologiya Bağı ərazisindən götürülmüş *Pinus eldarica* Medw. 1898, 1908, 1962, 2000, 2021-ci illərdə iqlim amillərinin təsiri nəticəsində növün inkişafı aşağı düşmüş, 1919, 1921, 1943, 1950 və 2019-cu illərdə isə yüksək inkişaf dinamikası göstərdiyi müəyyənləşdirilmişdir. Növün inkişafı normal qiymətləndirilir. Tədqiqatlar nəticəsində 203 sm gövdə diametrinə malik növün 1868-ci ildə əkildiyi, yaşının 155 olduğu məlum olmuşdur (qraf.1).

**Qrafik 1. Dendrologiya Bağı ərazisindən götürülmüş *Pinus eldarica* Medw. (A) *Pinus halepensis* Mill. (B) növlərinin gövdəsinin illik halqa ölçülərinə keyfiyyət göstəriciləri**






**A** **B**

**Şəkil 2. Gövdədən nümunələrin götürülməsi (A) və LİNTAB 6 binokuliyar mikroskopunda tədqiqi (B)**






*Pinus halepensis* Mill. hündürlüyü 25 m-ə, diametri 50 sm-ə çatan, düz və ya əyrigövdəli ağacdır. Cavan ağacların çətiri sıx, oval-konusvari və ya piramidaldır (Məmmədov, 2011: 167). Budaqları uzun, elastik, iynəyarpaqlarla örtülmüşdür, zoğları nazikdir, tumurcuqların uzunluğu 5-10 mm-ə çatır. İynəyarpaqları cüt-cüt yerləşir, yumşaq və nazikdir, cavan iynəyarpaqlar açıq-yaşıl,






yaşlı iynəyarpaqlar isə tünd-yaşıl olub, kənarları hamar, ucları sivriləşmişdir. Qozaları meyvə saplaqlarından asılı halda yerləşir, yetişmiş qozaların qalxancıqları iridir. Külək vasitəsilə tozlanır. Quraqlığa davamlı, işıqsevən və torpağa qarşı tələbkar olmayan növdür. Toxumla çoxalır. Park və bağların yaşıllaşdırılmasında Hələb (*P.halapensis*) şamından geniş istifadə edilir. Bağın ərazisindən götürülən 240 sm diametrli *Pinus halepensis* Mill. – Hələb şamı növünün 1895-ci ildə əkildiyi, 128 yaşı olduğu müəyyənləşdirilmişdir. Əldə edilən nəticələrə əsasən demək olar ki, *Pinus halepensis* Mill. növü 1932, 1934, 1942, 1998, 2002-ci illərdə yəni, 37, 39, 47, 103, 107 yaşlarında inkişafı yüksəlmiş, 1945,1954, 1961, 2002, 2008- ci illərdə 50, 59, 66, 107 və 113 yaşlarında isə aşağı inkişaf dinamikası müşahidə edilmişdir (cəd. 2).

**Cədvəl 2.**
**2023-cü ildə Dendrologiya bağının ərazisindən götürülmüş nümunələrin dendroxonoloji göstəriciləri**

| Növlər | Gövdənin diametri (sm) | Sahə Koordinatları | Ağacın yaşı |
|---|---|---|---|
| *Pinus eldarica* Medw. | 203 | 40º 29'18.4"N 50º 09'36.0"E Mərdəkan 'Dendrologiya Bağı' | 155 |
| *Pinus halepensis* Mill. | 240 | | 128 |

## Nəticə

Məqalədə *Pinus* L cinsinin 2 növünün dendroxronoloji təhlili aparılmış, iqlim amillərinin növlərə təsiri öyrənilmiş, növlərin inkişaf dinamikası verilmişdir. *Pinus eldarica* Medw. və *Pinus halepensis* Mill. növlərinin yaşlı nüsxələrindən nümunələr götürülərək, dendroxronoloji tədqiqatlar aparılmışdır.

Tədqiqatlar nəticəsində gövdə diametri 240 sm olan *Pinus halapenssis* Mill. növünün ($40^o29$ 18.4"N $50^o0936.0$"E) yaşının 128 il (inkişafa başladığı tarix 1895), gövdə diametri 203 sm olan *Pinus eldarica* Medw. ($40^o29$ 18.4"N $50^o0936.0$"E) növünün yaşının 155 il (inkişafa başladığı tarix 1868) olduğu müəyyənləşdirilmişdir. Yaşıllaşdırmada geniş istifadə edilən, dekorativ görünüşlü *Pinus eldarica* Medw. və *Pinus halepensis* Mill. növlərinin əhəmiyyətini nəzərə alaraq, onların təbii ehtiyatlardan daha səmərəli istifadə, ekoloji təhlükəsizliyin qorunması üzərində nəzarətin möhkəmləndirilməsi və bu kimi digər istiqamətlərdə kompleks işlərin görülməsi zərurəti yaradır və ciddi nəzarət tələb edir. Növlərin inkişafı hal-hazırki illərdə normal qiymətləndirilir. Müəyyən olunmuşdur ki, bağ məlhəminin tətbiqindən sonra ağaclarda inkişaf dinamikası yüksəlişə doğru getmişdir. Məlhəmin tətbiqi oduncağın radial artımına da effektiv təsir göstərmişdir. Bütün bunları nəzərə alaraq təbii ehtiyatlardan səmərəli istifadə, ekoloji təhlükəsizliyin qorunması üzərində nəzarətin möhkəmləndirilməsi və bu kimi digər istiqamətlərdə kompleks işlərin görülməsi nəzərdə tutulmalıdır.

## Ədəbiyyat

1. Mammadov, T., Balapour, S. (2016). Principles, Methods and application of Dendrochronology NAS of Azerbaijan, İSBN 5-8066-1591-X, 278 p.
2. Fritts, H. (1976).Tree rings and climate. London: Academic Press, 22 p.
3. Garcia, F. (2012). User İnterface to process and visualize tree-ring data using R. Dendrochronologia 30, pp.57-60.
4. https://e-derslik.edu.az/books/635/units/unit-1/page78.xhtml
5. https://amea-tsz.az/az%C9%99rbaycan-milli-elml%C9%99r-akademiyasi-t%C9%99crub%C9%99-s%C9%99naye-zavodu-mmc-nin-yeni-m%C9%99hsulu-bag-m%C9%99lh%C9%99mi-nin-genis-istehsali-basladi/
6. https://dendrologygarden.az/layihe.php?id=16
7. https://www.yenimedia.org/az/posts/detail/dendrologiya-bagi-publik-huquqi-sexsin-yasilliq-sahelerinde-bag-melhemi-preparati-tetbiq-edilir-1693370415
8. Cook, E. (1990). Methods of Dendrochronology. London: Kluwer Academic Publishers, pp.163-217.
9. Vaqanov, E. (1978). Ağac halqalarının refletoqramlarından istifadə edərək meteoroloji şəraitin öyrənilməsi. Moskva: Elm, s.103-115.
10. Bagirova, S. (2020). The study of the radial growth of the flora species which do not have special protection on the southern hillsides of Greater Caucasus, pp.21-27.
11. Schweingruber, F. (1996). Tree Rings and evaronment Dendrochronology, 609 p.
12. Rinn, F. (1996). TSAP Version 3.0 Reference manual computer program for time series analysis and presentation copyright Frank Rin Distrubution, Germany: Heidelberg, 246 p.
13. Şiyatov, S. (2000). Dendroxronologiyanın metodları. Rusiya: Krasnodar, 80 s.
14. Bagirova, S. (2019). Azərbaycanın meşə təsərrüfatında bəzi növlərə dendroxronoloji üsulların tətbiqi. 25-30 s.
15. Qurbanov, E. (2009). Ali bitkilərin sistematikası. Bakı: Elm, s.131-132.
16. Məmmədov, T. (2011). Azərbaycan dendroflorası I cild. Bakı: Elm, 167 s.

Göndərilib: 29.09.2023 Qəbul edilib: 05.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/52-58

**Afaq Əliyeva**
Naxçıvan Dövlət Universiteti
biologiya üzrə fəlsəfə doktoru
afagaliyeva100@gmail.com
UOT 582. 683.2 (47)

# NAXÇIVAN MUXTAR RESPUBLİKASI FLORASINDA KƏLƏMKİMİLƏR – *BRASSICACEAE* BURNETT. FƏSİLƏSİNİN BƏZİ MONOTİP NÖVLƏ TƏMSİL OLUNAN CİNSLƏRİNİN BİOEKOLOJİ VƏ FAYDALI XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Məqalə Naxçıvan MR florasında Kələmkimilər – *Brassicaceae* Burnett. fəsiləsinin bəzi monotip növlə təmsil olunan – *Alliaria* Heist. ex Fabr. – Sarımsaqotu, *Anchonium* DC. – Anxoni, *Asperuginoides* Rauschert (*Buchingera* Boiss. & Hohen.) – Buxinqer, *Bunias* L. – Təpəotu, *Calepina* Adans. – Kalepina, *Capsella* Medik. – Quşəppəyi, *Cardamine* L. – Ürəkotu, *Coluteocarpus* Boiss. – Şaqqıldaqmeyvə, *Cymatocarpus* O.E. Schultz – Sərbəstmeyvə və *Nasturtium* R.Br. – Qıjı kimi cinslərinin bioekoloji və əhəmiyyətli xüsusiyyətlərindən bəhs olunur.

Burada qeyd olunan cinslərə məxsus növlərin yayıldığı hündürlük qurşaqları, ekoloji mühiti, rütubətə münasibətə görə ekoloji qrupu, həyat forması, coğrafi areal tipləri, faydalı xüsusiyyətləri barədə məlumatlar qeyd olunmuşdur. Bunlarla yanaşı həmin cinslərin Naxçıvan florası üçün xarakterik, Azərbaycan florasının endemi və Naxçıvan Muxtar Respublikasının Qırmızı Kitabına daxil edilən nümayəndələri haqqında da məlumatlar qeyd olunmuşdur. Aşkar olunan növlərin yerlərinin gələcək tədqiqatçılara məlum olmasını nəzərə alaraq, gedilən ərazilərin dəniz səviyyəsindən hündürlükləri və koordinatları da qeyd olunmuşdur.

***Açar sözlər:*** *kələmkimilər, fəsilə, cins, növ, areal, bioekologiya*

**Afag Aliyeva**
Nakhchivan State University
PhD in biology
afagaliyeva100@gmail.com

## Bioecological and useful characteristics of some monotypic species of the genus of the family *Brassicaceae* Burnett in the flora of Nakhchivan Autonomous Republic

**Abstract**

The article discusses the bioecological and important characteristics of some monotypic species of the genus, family *Brassicaceae* Burnett - *Alliaria* Heist. ex Fabr. – Garlic, *Anchonium* DC. – Lobeder, *Asperuginoides* Rauschert (*Buchingera* Boiss. and Hohen.) – Sverbiga. – *Calepina* Adans. - Calepina, *Capsella* Medik. – Shepherd's purse, *Cardamine* L. – Meadow heart, *Coluteocarpus* Boiss. – Cymatocarpus O.E. – *Nasturtium* R.Br. - Freefruit beetroot common in the flora of Nakhchivan Autonomous Republic.

Here information is provided about altitudinal zones, ecological environment, ecological group by humidity, life form, types of geographic range, beneficial properties of species belonging to these genera. In addition, information was also mentioned about representatives of genera characteristic of the flora of Nakhchivan, endemic to the flora of Azerbaijan, included in the Red Book of the Nakhchivan Autonomous Republic. Considering that future researchers will know the location of the discovered species, the altitudes and coordinates of the areas visited are also noted.

***Keywords:*** *cruciferous, family, genus, species, habitat, bioecology*

## Giriş

*Brassicaceae* Burnett. fəsiləsinin dünya florasında 350 cinsdə birləşən 3000 növü, Azərbaycan Respublikası florasında 74 cinsdə - 248, Naxçıvan MR florasında 67 cinsdə toplanan 165 növü bitir.

Bu növlər müxtəlif hündürlük qurşaqları və ekoloji mühitlərdə yayılmışdır. Fəsilə bitkiləri əsasən kserofit tipli növlər olub, respublika ərazisinin quru iqliminə mənsub ərazilərdə yayılmışdır. *Brassicaceae* Burnett. fəsiləsinin tərkibində ən çox növ sayı 13 olan cinslərlə yanaşı, bir və ya iki növlə təmsil olunan cinslər də vardır. Fəsilə bitkiləri faydalı xüsusiyyətləri ilə səciyyələnir. Belə ki, növlər arasında balverən, qida, dərman, ədviyyə, yem, kosmetik, dekorativ əhəmiyyətli bitkilər də vardır.

Kələmkimilər – *Brassicaceae* Burnett. fəsiləsinin ərazi florasında 67 cinsə daxil olan 165 növü yayılmışdır. Bu cinslər arasında *Alyssum* L. – Çuğundurot (13 növ), *Erysimum* L. –İsitməotu (13 növ), *Lepidium* L. – Bozalaq (10 növ), *Isatis* L. – Rəngotu (9 növ), *Aethionema* R.Br. – Pulcuqluot (8 növ) çoxsaylı növlərə malikdir. Bu cinslərlə yanaşı fəsilənin monotip növlə təmsil olunan cinsləri də var (Talıbov, 2021: 147-157).

**Tədqiqatın yeri və üsulları.** Tədqiqatlar Naxçıvan Muxtar Respublikasının Babək rayonunun Arazboyu düzənlikləri, Naxçıvan şəhərətrafı çəmənliklər və meyvə bağları yerləşən ərazilər, Kəngərli rayonunun Çalxanqala və Təzəkənd ətrafı, Culfa rayonun Boyəhməd, Ərəfsə, Xəzinədərə, Kola meşəsi, Ordubad rayonunun Düylün, Üstüpü, Məzrə və Şahbuz rayonlarının - Şahbuz Dövlət təbiət qoruğu (Batabat meşəsi ətrafı), Kükü-Dərəboğaz, Aşağı-Yuxarı Buzqov, kəndlərini əhatə etmişdir. Tədqiqatlar zamanı ərazilərin dəniz səviyyəsindən hündürlükləri (DSH) və koordinatları da qeydə alınmışdır. İlkin yaz (mart-aprel ayları) florasının intensiv yayılma dövrlərini əhatə etməklə, növlərin vegetasiya müddətinin sona (avqust-sentyabr ayları) yaxınlaşması dövrlərinə qədər, tədqiqatlar davam etdirilmişdir. Tədqiqat obyekti isə *Brassicaceae* Burnett. fəsiləsi cinslərinin monotip növləri olmuşdur. Ərazilərə gedilən ekspedisiyalar və sərbəst marşrutlar zamanı cinsin yayıldığı ekocoğrafi şərait müəyyənləşdirilmiş, bitki nümunələri toplanılmış, herbariləri hazırlanmış və növlər təyinedicilər vasitəsilə müəyyən olunmuşdur. Tədqiqatlar aparılan ərazilərin kordinatları aşağıdakı kimidir: Xəzinədərə - DSH 1835 m koordinat 39°18′58″N, 45°47′20″E, 1781 m-39°18′58″N, 45°47′22″E, 1810 m-39°18′59″N, 45°47′22″E, Kükü-Dərəboğaz-1908 m 39°32′12″N, 45°37′2″E, 1995 m- 39°32′39″N, 45°36′39″E, 2021 m-39°32′52″N, 45°35′49″E, 2074 m 39°32′52″N 45°36′1″E; Yuxarı Buzqov – 1604 m- 39°30′56″N, 45°22′52″E, 1619 m-39°31′0″N, 45°22′52′E, 1688 m- 39°31′3″N, 45°22′41″E: Naxşıvan şəhərətrafı çəmənliklər və meyvə bağları-882 m 39°12′38,259″N, 45°24′53,52552″E; Şahbuz Dövlət təbiət qoruğu (Batabat meşəsi ətrafı – 2010 m-39°31′49,32588″N, 45°46′50,59812″E;)

Tədqiqat işində cinslərin taksonomiyası işlənərkən coğrafi areal tipləri (Qrossqeym, 1950: 108-252; Seyidov, İbadullayeva, Qasımov, Salayeva, 2014: 267-293; Qrossqeym,1946: 671; Nəbiyeva, 2013: 122-132), həyat formaları (Plaksina, 2001: 135-144) əsərlərdən istifadə olunmuşdur. Cinsə aid olan növlər (Talıbov, 2021:147-157; OTTCOFBBDITFONAROA, 2023: 4-7; German, 2022: 146-152) tədqiqatlara əsasən dəqiqləşdirilmişdir.

Növlərin təyinində, eləcə də adlarının dəqiqləşdirilməsində ümumi qəbul edilmiş: “Biolib”, “EOL”, “İTİS”» Beynəlxalq nomenklaturalardan da istifadə olunmuşdur (9, 10, 11)

**Təhlil və müzakirə.** Tədqiqat aparılan ərazilərdə aşağıdakı növlər tapıldı:

*Alliaria* Heist. ex Fabr. – Sarımsaqotu cinsinin dünyada və Azərbaycanda 2, Naxçıvan Muxtar Respublikası florasında bir növü yayılmışdır. *Alliaria petiolata* (Bieb.) Cavara və Grande (*A. officinalis* Andrz. ex Bieb.) – Dərman sarımsaqotu növü 20-100 sm hündürlükdə bitki olub, IV-V aylarda çiçəkləyir,VI-VIII aylarda isə meyvə verir. Bitki antihelmintik təsirə malikdir, yerli qıcıqlandırıcı (xardal plasterləri əvəzinə) kimi istifadə olunur. Bronxial astma, sinqa, ishal, çiban və yanıqların müalicəsində faydalıdır.

*Anchonium* DC. – Anxoni cinsinin dünyada 3, Azərbaycanda və Naxçıvan MR florasında bir növü yayılmışdır. *Anchonium elichrysifolium* (DC.) Boiss. – Quruyarpaq anxoni növü 10-35 sm hündürlükdə bitki olub, V-VI aylarda çiçəkləyir, VI –VII aylarda isə meyvə verir.

*Asperuginoides* Rauschert (*Buchingera* Boiss. and Hohen.) – Buxinqer cinsinin dünyada,

Azərbaycanda və Naxçıvan MR florasında bir növü yayılmışdır. *Asperuginoides axillaris* (Boiss. and Hohen.) Rauschert (*Buchingera axillaris* Boiss. and Hohen.) – Qoltuqmeyvə buxinqer növü 10-70 sm hündürlükdə bitki olub, IV- V aylarda çiçəkləyir, VI- VII aylarda isə meyvə və toxum verir.

*Bunias* L. – Təpəotu cinsinin dünyada 5, Azərbaycanda və Naxçıvan MR florasında bir növü yayılmışdır. Təpəotunu "Bunios" adı altında yunan həkimi Dioskorid (e.ə.50-ci il) dərman bitkiləri sırasına daxil etmişdir (Poqorelova, 2016: 69-70]. *Bunias orientalis* L. – Şərq təpəotu növü 25-80 (100) sm hündürlükdə bitki olub, IV-V (VI) aylarda çiçəkləyir, VI-VII aylarda isə meyvə və toxum verir.

*Calepina* Adans. – Kalepina cinsinin dünyada 5, Azərbaycanda və Naxçıvan MR florasında bir növü yayılmışdır. *Calepina irregularis* (Asso) Thell. – Əyri kalepina növü 20-60 sm hündürlükdə bitki olub, IV-V aylarda çiçəkləyir, V-VI aylarda isə meyvə və toxum verir.

*Capsella* Medik. – Quşəppəyi cinsinin dünyada 6, Azərbaycanda və Naxçıvan MR florasında bir növü yayılmışdır. *Capsella bursa - pastoris* (L.) Medik. – Adi quşəppəyi növü 5-60 sm hündürlükdə bitki olub, IV-V (IX) aylarda çiçəkləyir, V-VII (IX) aylarda isə meyvə verir. Bitkinin tərkibində qlikozidlər, saponinlər, alkaloidlər, aminlər, inozit, üzvi turşular, fitonsidlər, aşı maddələri, C və K vitaminləri vardir. K vitamini qankəsici təsirə malik olduğu üçün uşaqlıq, mədə-bağırsaq, böyrək, ağciyər qanaxmalarında istifadə olunur. Həmçinin otundan dəmlənmiş çay daxili qanaxmalarda istifadəsi faydalıdır (Əliyev, Hüseynov, Qurbanov, Tağıyev, 2016: 91-92).

*Cardamine* L. – Ürəkotu cinsinin dünyada 100-dən artıq, Azərbaycanda 8, ərazi florasında isə bir növü yayılmışdır. *Cardamine uliginosa* Bieb. (*C. amara* L. x *C. dentata* Schult.) – Bataqlıq ürəkotu növü 20-40 (50) sm hündürlükdə kökümsov gövdəli bitki olub, V-VI (VIII) aylarda çiçəkləyir, VI-VIII (IX) aylarda isə meyvə və toxum verir.

*Coluteocarpus* Boiss. – Şaqqıldaqmeyvə cinsinin dünyada, Azərbaycanda və ərazi florasında bir növü yayılmışdır. *Coluteocarpus vesicaria* (L.) Holmboe – Torlu şaqqıldaqmeyvə növü 8-20 sm hündürlükdə bitki olub, V-VI aylarda çiçəkləyir, VI-VIII aylarda isə meyvə və toxum verir.

*Cymatocarpus* O.E. Schultz – Sərbəstmeyvə cinsinin dünyada 3, Azərbaycanda və ərazi florasında bir növü yayılmışdır. *Cymatocarpus Grossheimii* N.Busch – Qrossheym sərbəstmeyvəsi növü 20-40 sm hündürlükdə bitki olub, V-VII aylarda çiçəkləyib meyvə və toxum verir.

*Nasturtium* R.Br. – Qıjı cinsinin Azərbaycanda və ərazi florasında bir növü yayılmışdır. *Nasturtium officinale* R.BR. – Dərman qıjısı növü 10-60 sm hündürlükdə bitki olub, V-VII aylarda çiçəkləyir, VII-VIII aylarda isə meyvə və toxum verir. Bitkinin tərkibində karotin, piyli yağlar, saponin, alkaloid, qlikozidlər, C və E vitaminləri vardır. Diuretik, abortiv, işlədici, maddələr mübadiləsini yaxşılaşdıran təsiri vardır. Qaraciyər, revmatizm, böyrək, yuxarı tənəffüs yolları xəstəlikləri, öd kisəsi daşı, dəri, sinqa, xoş və bəd xassəli şişlər, şəkərli diabet, podaqra, yanıqlar, anemiya, ziyil və döyənək zamanı istifadəsi əhəmiyyətlidir (Poqorelova, 2016: 69-70).

Növlərin bioekoloji xüsusiyyətləri aşağıdakı cədvəldə qeyd olunmuşdur:

**Cədvəl 1.**
**Kələmkimilər – *Brassicaceae* Burnett. fəsiləsinin bir sıra növlərinin yayıldığı hündürlük qurşağı, ekoloji mühiti və qrupu**

| № | Növlər | Hündürlük qurşaqları | Ekoloji mühiti | Ekoloji qrupu |
|---|---|---|---|---|
| 1. | *Alliaria petiolata* (Bieb.) Cavara & Grande (*A. officinalis* Andrz. ex Bieb.) – Dərman sarımsaqotu | Orta dağ qurşağına qədər | Meşələr, kolluqlar kənarı, parklarda alaq otu kimi | Mezofit |
| 2. | *Anchonium elichrysifolium* (DC.) Boiss. – Quruyarpaq anxoni | Subalp və alp yüksəkliyi | Daşlı, qayalı yerlər | Kserofit |

| | | | | |
|---|---|---|---|---|
| 3. | *Asperuginoides axillaris* (Boiss. & Hohen.) Rauschert (*Buchingera axillaris* Boiss. & Hohen.) – Qoltuqmeyvə buxinqer | Orta dağ qurşağı | Enliyarpaqlı meşələr, daşlı torpaqlar | Mezokserofit |
| 4. | *Bunias orientalis* L. – Şərq təpəotu | Aşağı dağ qurşağından subalp yüksəkliyinə qədər | Çəmənlər, alaqlı yerlər, əkinlər | Mezofit |
| 5. | *Calepina irregularis* (Asso) Thell. – Əyri kalepina | Düzənlik, dağətəyi | Alaqlı yerlər, az rütubətli yerlər | Mezokserofit |
| 6. | *Capsella bursa - pastoris* (L.) Medik. – Adi quşəppəyi | Düzənlikdən alp yüksəkliyinə qədər | Yollar və alaqlı yerlər | Mezokserofit |
| 7. | *Cardamine uliginosa* Bieb. (*C. amara* L. x *C. dentata* Schult.) – Bataqlıq ürəkotu | Orta və yuxarı dağ qurşağı | Daşlı yamaclar və oazis (bəzən) | Kseromezofit |
| 8. | *Coluteocarpus vesicaria* (L.) Holmboe – Torlu şaqqıldaqmeyvə | Orta dağ qurşağından yuxarı qurşağa qədər | Quru və daşlı yamaclar | Kserofit |
| 9. | *Cymatocarpus Grossheimii* N.Busch – Qrossheym sərbəstmeyvəsi | Dağətəyi | Quru, daşlı yamaclar | Kserofit |
| 10. | *Nasturtium officinale* R.BR. – Dərman qıjısı | Orta dağ qurşağına qədər | Bataqlıqlar, nəmli yerlər və su sahili | Hidrofit |

Cədvəldən göründüyü kimi növlər qanunauyğun şəkildə müxtəlif yüksəkliklər və ekoloji mühitlərdə yayılmışdır. Ekoloji qrupuna görə də həmçinin müxtəlif qruplara aiddir.

Bu növlərin həyat forması, coğrafi areal tipləri və əhəmiyyəti barədə məlumatlar aşağıdakı cədvəldə verilmişdir:

**Cədvəl 2.**
**Kələmkimilər – *Brassicaceae* Burnett. fəsiləsinin bir sıra növlərinin yayıldığı həyat forması, coğrafi areal tipi və faydalı xüsusiyyətləri**

| № | Növlər | Həyat forması | Coğrafi areal tipi | Faydalı xüsusiyyətləri |
|---|---|---|---|---|
| 1. | *Alliaria petiolata* (Bieb.) Cavara & Grande (*A. officinalis* Andrz. ex Bieb.) – Dərman sarımsaqotu | İkiillik | Palearktika | Ədviyyat, dərman, yem, balverən |
| 2. | *Anchonium elichrysifolium* (DC.) Boiss. – Quruyarpaq anxoni | Çoxillik | Qərbi Asiya | |
| 3. | *Asperuginoides axillaris* (Boiss. & Hohen.) Rauschert (*Buchingera axillaris* Boiss. & Hohen.) – Qoltuqmeyvə buxinqer | Birillik | İran-Turan | |
| 4. | *Bunias orientalis* L. – Şərq təpəotu | Birillik və ya ikiillik | Qərbi Asiya | Qida, balverən |
| 5. | *Calepina irregularis* (Asso) Thell. – Əyri kalepina | Birillik | Aralıq dənizi | Qida |
| 6. | *Capsella bursa - pastoris* (L.) Medik. – Adi quşəppəyi | Birillik | Holarktika | Dərman və balverən |
| 7. | *Cardamine uliginosa* Bieb. (*C. amara* | Çoxillik | Ön Asiya | |

| | | | | |
|---|---|---|---|---|
| | L. x *C. dentata* Schult.) – Bataqlıq ürəkotu | | | |
| 8. | *Coluteocarpus vesicaria* (L.) Holmboe – Torlu şaqqıldaqmeyvə | Çoxillik | Kiçik Asiya | |
| 9. | *Cymatocarpus Grossheimii* N.Busch – Qrossheym sərbəstmeyvəsi | Birillik | Atropatan | |
| 10. | *Nasturtium officinale* R.BR. – Dərman qıjısı | Çoxillik | Avropa | Dərman, qida, bal və çiçək tozu verən, yem, ədviyyə |

Yuxarıdakı məlumatlara əsasən 4 növ birillik, 4 növ çoxillik, bir növ ikiillik, bir növ isə birillik və ya ikiillik həyat formasına malikdir. Qeyd olunan növlər arasında balverən, ədviyyat, dərman, yem və qida əhəmiyyətli bitkilər də vardır.

Bu cinslərə məxsus növlər arasında Naxçıvan MR florası üçün xarakterik, Azərbaycan florasının endemi və Naxçıvan Muxtar Respublikasının Qırmızı Kitabına daxil edilən nümayəndələr də vardır. Bu haqda məlumatlar aşağıdakı cədvəldə qeyd olunmuşdur:

**Cədvəl 3.**
**Kələmkimilər – *Brassicaceae* Burnett. fəsiləsinin bir sıra cinslərinin Naxçıvan florası üçün xarakterik, Azərbaycan florasının endemi və Naxçıvan Muxtar Respublikasının Qırmızı Kitabına daxil edilən növləri**

| № | Növlər | Naxçıvan florası üçün xarakterik | Azərbaycan florasının endemi | Naxçıvan MR-in Qırmızı Kitabına daxil edilən |
|---|---|---|---|---|
| 1. | *Alliaria petiolata* (Bieb.) Cavara & Grande (*A. officinalis* Andrz. ex Bieb.) – Dərman sarımsaqotu | | | |
| 2. | *Anchonium elichrysifolium* (DC.) Boiss. – Quruyarpaq anxoni | | | |
| 3. | *Asperuginoides axillaris* (Boiss. & Hohen.) Rauschert (*Buchingera axillaris* Boiss. & Hohen.) – Qoltuqmeyvə buxinqer | | | Lower Risk-LR [a-Conservation Dependent –CD (Naxçıvan) |
| 4. | *Bunias orientalis* L. – Şərq təpəotu | | | |
| 5. | *Calepina irregularis* (Asso) Thell. – Əyri kalepina | | | |
| 6. | *Capsella bursa - pastoris* (L.) Medik. – Adi quşəppəyi | | | |
| 7. | *Cardamine uliginosa* Bieb. (*C. amara* L. x *C. dentata* Schult.) – Bataqlıq ürəkotu | | | |
| 8. | *Coluteocarpus vesicaria* (L.) Holmboe – Torlu şaqqıldaqmeyvə | + | | |
| 9. | *Cymatocarpus Grossheimii* N.Busch – Qrossheym sərbəstmeyvəsi | + | + | |
| 10. | *Nasturtium officinale* R.BR. – Dərman qıjısı | | | |

## Nəticə

Ərazi florasında tapılan bitkilərdən: *Cymatocarpus Grossheimii* N.Busch – Qrossheym sərbəstmeyvəsi növü Azərbaycan florasının endemidir. Kələmkimilər fəsiləsinin *Coluteocarpus* Boiss. – Şaqqıldaqmeyvə və *Cymatocarpus* O.E. Schultz – Sərbəstmeyvə cinsləri bir növlə təmsil olunur və bu cinslər Azərbaycanın Naxçıvan florası üçün xarakterikdir (Əsgərov, 2016: 183-198). *Asperuginoides axillaris* (Boiss. & Hohen.) Rauschert (*Buchingera axillaris* Boiss. & Hohen.) – Qoltuqmeyvə buxinqer növü Naxçıvan Muxtar Respublikasının Qırmızı Kitabına daxil edilmişdir.

Gedilən ekspedisiyalar zamanı çəkilmiş bəzi fotoşəkillər:





**Şəkil 1,2,3. *Nasturtium officinale* R.BR.-Dərman qıjısı (Kəngərli rayon Çalxanqala kənd ətrafı)**



**Şəkil 4. *Capsella bursa - pastoris* (L.) Medik. – Adi quşəppəyi**

## Ədəbiyyat

1. Talıbov, T.H., İbrahimov, Ə.Ş., İbrahimov, Ə.M. (2021). Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri (Ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilər, II nəşr), Naxçıvan, s.147-157.
2. Grossqeym, A.A. (1950). Flora Kavkaza, Tom IV, Leningrad: izdatelstvo Akademyy nauk SSSR, s.108-252.
3. Seyidov, M.M., İbadullayeva, S.C., Qasımov, H.Z., Salayeva, Z.K. (2014). Şahbuz dövlət təbiət qoruğunun flora və bitkiliyi, Naxçıvan: Əcəmi, s.267-293
4. Qrossqeym, A.A. (1946). Rastitelnie resursi Kavkaza. Baku: izdatelstvo AN Azerbaydjanskoy SSR, 671 s.
5. Nəbiyeva, F.X. (2013). Brassicaceae Burnett. fəsiləsinin Şahbuz rayonunda yayılmış faydalı bitkiləri. Azərbaycan Milli Elmlər Akademiyası Naxçıvan Bölməsi, Xəbərlər, Təbiət və texniki elmlər seriyası, cild 9, № 4, s.122-132.
6. Plaksina, T.İ. (2001). Konspekt flori Volgo-Uralskogo regyona, Samara: İzdatelstvo “Samarski Universitet”, s.135-144.
7. Aliyeva, A.M. (2023). On the taxonomic composition of family *Brassicaceae* Burnett, dıstributed in the flora of Nakhchivan Autonomous Republic of Azerbaijan. Sciences of Europe (Praha, Czech Republic), No 127, SJIF Impact Factor - 5.974.
8. German, D.A. (2022). To the species composition of cruciferous plants (Crucifer) in Russia and some neighboring countries, Altai State University, prosp. Lenina, d. 61, 656049, Barnaul, Russia, Turczaninowia 25, 1, s.146-152.
9. https://az.wikipedia.org/wiki/Eol
10. https://www.gbif.org/dataset/9ca92552-f23a-41a8-a140-01abaa31c931
11. _ttps://en.wikipedia.org/wiki/Integrated_Taxonomic_Information_System
12. Pogorelova, E.S. (2016). (student Permskaya gosudarstvennaya farmatsevticheskaya akademiya) Lekarstvennie rasteniya semeystva Kapustnie, Molodoy uchyoniy mezhdunarodniy nauchniy jurnal, № 1 (105), s.69-70.
13. Əliyev F.Y., Hüseynov R.İ., Qurbanov Q.B., Tağıyev R.M. (2016). Bitkilər müalicə mənbəyidir. Gəncə: “Elm”, 241 s.
14. Əsgərov A. M. (2016). Azərbaycanın bitki aləmi. Bakı: TEAS Press, s.183-198
15. Naxçıvan Muxtar Respublikasının Qırmızı Kitabı (Ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilər), II cild, (2010). Naxçıvan: Əcəmi, s. 322-330.
16. Flora Azerbaydjana IV toma. (1953). Baku: “Izdatelstvo akademyy nauk Azerbaydzhanskoy SSR”, s.141-328.

Göndərilib: 25.09.2023 Qəbul edilib: 01.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/59-65

**Enzalə Novruzova**
Naxçıvan Dövlət Universiteti
biologiya üzrə fəlsəfə doktoru
enovruzova_32@mail.ru

# NAXÇIVAN MUXTAR RESPUBLİKASI FLORASINDA ƏMƏKÖMƏCİKİMİLƏR - *MALVACEAE* JUSS. FƏSİLƏSİ BİTKİLƏRİNİN TAKSONOMİK VƏ COĞRAFİ TƏHLİLİ

**Xülasə**

Naxçıvan Muxtar Respublikanın zəngin florasında dünyanın əksər flora və bitkilik tipləri təşəkkül tapmışdır. Ərazi florasına daxil olan qədim (relikt) bitki qruplarından biri də Əməköməcikimilər fəsiləsidir. Fəsilənin tərkibinə daxil olan cins və növlər bu günədək sistematik, filogenetik və florogenetik baxımdan tam öyrənilməmişdir. Bu səbəbdən Naxçıvan Muxtar Respublikasında Əməköməcikimilər (*Malvaceae* Juss.) fəsiləsi bitkilərinin sistematik və coğrafi təhlili aktualdır.

Məqalədə, muxtar respublika florasında Əməköməcikimilər fəsilənin bir yarımfəsilə (*Malvoideae* Burnett), 3 triba (*Malveae* J. Presl, *Hibisceae* Richb., *Gossypieae* L.), 9 cinsə (*Abutilon* Mill., *Alcea* L., *Althaea* L., *Malva* L., *Malvella* Jaub. & Spach., Hibiscus L., nom. cons., Lavatera L., Gossypium L., Abelmoschus Medik.) daxil olan 22 növlə təmsil olunduğu göstərilmişdir. Həmçinin növlərin areoloji təhlili aparılmışdır.

***Açar sözlər:*** *Malvaceae Juss., sistematika, coğrafi təhlil, fəsilə, cins, növ*

**Enzala Novruzova**
Nakhchivan State University
PHD in biology
enovruzova_32@mail.ru

## Taxonomical and geographical analysis of Malvaceae Juss family plants in the flora of Nakhchivan Autonomous Republic

**Abstract**

Most of the world's flora and plant species occur in the rich flora of the Nakhchivan Autonomous Republic. One of the ancient (relic) plant groups in the flora of the region is the Arboriaceae family. The genera and species in the section have not been fully investigated systematically, phylogenetically and fluorogenetically. Therefore, systematic and geographical analysis of *Malvaceae* Juss. family plants in Nakhchivan Autonomous Republic is important.

In the article, the flora of the autonomous republic includes one subdivision (Malvoideae Burnett), 3 tribes (*Malveae* J. Presl, *Hibisceae* Richb., *Gossypieae* L.), 9 genera (*Abutilon* Mill., *Alcea* L., *Althaea* L. *Malva* L., *Malvella* Jaub, from the *Malvoideae Burnett* family. & Spach., *Hibiscus* L., nom. cons., *Lavatera* L., *Gossypium* L., *Abelmoschus* Medik.) were shown to be represented by 22 species. Areological analyzes of the species were also performed.

***Keywords:*** *Malvaceae Juss., systematic, geographical analysis, family, genera, species*

## Giriş

Naxçıvan Muxtar Respublikası ərazisində bioloji müxtəlifliyin hərtərəfli tədqiqi müasir botanikanın aktual problemlərindəndir. Antropogen təsirlərin, xüsusilə də texnogen təsirlərin inkişafı ərazidə flora və bitkiliyinin məhv olmasına gətirib çıxarır. Buna əsaslanaraq floranın ayrı-ayrı sistematik qruplarının (fəsilə, cins, növ) müasir metodlarla öyrənilməsi, onların yayılma zonalarının müəyyən edilməsi və areoloji təhlili mühüm elmi və praktik əhəmiyyətə malikdir.

Aparılan tədqiqatlar yalnız bitkilərin sistematik, ekoloji-coğrafi, fitosenoloji xüsusiyyətlərini müəyyən etmir, həmçinin onların antropogen təsir altında səmərəli istifadəsi, qorunma yollarının düzgün təşkil edilməsinə və genefondunun toplanaraq, mühafizə olunmasına kömək edir.

Muxtar respublikası ərazisində yayılan və floranın əmələ gəlməsində mühüm yer tutan qədim bitki fəsilələrindən biri də Əməköməcikimilər fəfiləsidir. Malvaceae Juss. fəsiləsi Yer Kürəsinin tropik və subtropik zonalarında 244 cinsə daxil olan 4225 növlə təmsil olunur. Fəsilənin tərkibində iqtisadi əhəmiyyətə malik olan cinslərdən bamya, pambıq və kakao, bəzək bitkilərindən *Alceae, Malva* və *Tillia* cinsləri daha geniş yayılmışdır. Növlərin sayına görə ən böyük cinslərə *Hibiskus* – 300 növ, *Sterculia* – 250 növ, *Dombeya* – 250 növ, *Pavonia* – 200 növ, *Sida* – 200 növ daxildir (Əsgərov, 2016: 203-208; İbadullayeva, 2012:127-129; İbadullayeva, 2013:1328-1333; İbadullayeva, 2015: 114-117).

Malvaceae Juss. – Əməköməcikimilər fəsiləsinin tərkibinə daxil olan növlərin sistematikası mübahisə doğurur. Belə ki, *Sensu Stricto* qeydiyyatı ilə aparılan təsnifata əsasən fəsilənin kladistik monofiletik, yəni eyni əcdaddan törəyən və ortaq nöqtələri eyni olan qruplardan ibarət olduğu irəli sürülmüşdür. *Sensu Lato* təsnifat prinsipinə əsasən Əməköməcikimilər fəsiləsi bitkilərinin sistematik tərkibi genetik tədqiqatlara əsasən verilmişdir. Məlum olmuşdur ki, müasir tədqiqatlar nəticəsində fəsilənin sistematik strukturu müəyyən edilərkən *Sensu Lato* prinsipi əsas götürülmüşdür. Bu prinsipə əsasən genetik əlaqələr nəticəsində *Bombaceae, Tiliaceae* və *Sterculiaceae* fəsilələri ayrı-ayrı cinslər kimi *Malvaceae* Juss. fəsiləsinin tərkibinə daxil edilmişdir.

APG beynəlxalq sisteminə əsasən Malvaceae Juss. – Əməköməcikimilər fəsiləsi 9 yarımfəsilədə birləşərək Şimal və Cənub qütblərindən başqa bütün tropik və subtropik ərazilərdə rast gəlinir (kaldoqram) (APG, 2009: 105-121).

Əməköməcikimilər fəsiləsinin 9 yarımfəsilədə birləşməsinin genetik əlaqələri 2021-ci ildə Amerikan tədqiqatçıları tərəfindən aparılan genomik tədqiqatlar nəticəsində təsdiq edilmişdir. Belə ki, filogenetik əlaqələrə nəzər saldıqda aydın olur ki, yarımfəsilələrin müxtəlif yayılma zonalarına baxmayaraq onlar genetik cəhətdən biri-birini tamamlayırlar.

**Kaldoqram**
**Əməköməcikimilər – Malvaceae Juss. fəsiləsinin**
**yarımfəsilələr üzrə bölünməsi**

*Byttnerioideae*: 26 cins, 650 növ, pantropik, əsasən Cənubi Amerika
*Grewioideae*: 25 cins, 770 növ, pantropik
*Sterculioideae*: 12 cins, 430 növ, pantropik
*Tilioideae*: 3 cins, 50 növ, Şimali tropik zonalar və Mərkəzi Amerika
*Dombeyoideae*: 20 cins, 380-ə qədər növ, paleotropik, əsasən Madaqaskar
*Brownlowioideae*: 8 cins, 70 növ, paleotropik
*Helicteroideae*: 8-12 cins, 10-90 növ, tropik, əsasən Cənub-Şərqi Asiya
*Malvoideae*: 78 cins, 1670 növ, mülayim – tropik
*Bombacoideae:* 12 cins, 120 növ, tropik, əsasən Afrika və Amerika

Aparılan tədqiqatlar, ədəbiyyat materialları və herbari nümunələrinə əsasən aydın olmuşdur ki, Naxçıvan Muxtar Respublikası biomüxtəlifliyində xüsusi yeri olan *Malvaceae* Juss. fəsiləsi nümayəndələrinin sistematik təhlili aparılaraq elmi əsaslı nəticələr əldə edilmişdir.

Azərbaycan florasında fəsilənin respublika ərazisində 9 cinsə (Köməci - *Malvella* Jaub. & Spach., Əməköməci - *Malva* L., Xətmi - *Lavatera* L., Gülxətmi - *Alcea* L., Bəlğəmotu - *Althaea* L., Dəli əməköməci – *Malvalthaea* Iljin., Kəndirotu - *Abutilon* Mill., Hibiskus - *Malvella* Jaub. & Spach., Beşmeyvə - *Kosteletzkya* Presl.) tərkibinə daxil olan 36 növünü (*Malvella sherardiana* (L.) Jaub. & Spach - Jerard köməcisi, *Malva leiocarpa* Iljin. – Tüksüzmeyvə əməköməci, *Malva armeniaca* Iljin. – İrəvan əməköməcisi, *Malva sylvestris* L. - Meşə əməköməcisi, *Malva erecta* Presl. – Düzqalxan əməköməci, *Malva mauritiana* L. – Mavritan əməköməci, *Malva Grossheimii* Illin. – Qrossheym əməköməcisi, *Malva niceaeensis* All. – Türkmən əməköməcisi, *Malva neglecta*

Wallr. - Alaq əməköməci, *Malva pusilla* Sm. In Engl. – kiçik əməköməci, *Malva parviflora* L. – Kiçikçiçək əməköməci, *Lavatera thuringiaca* L. - Türüngə xətmi, *Lavatera punctata* All. – Nöqtəli xətmi, *Alcea rugosa* Alef. - Qırışıq gülxətmi, *Alcea kusariensis* Iljin. – Qusar gülxətmi, *Alcea lenkoranica* Iljin. – Lənkəran gülxətmi, *Alcea tabrisiana* (Boiss. & Buhse) Iljin - Təbriz gülxətmi, *Alcea sachsachanica* Iljin. – Sağsağanlı əməköməci, *Alcea flavovirens* (Boiss. and Buhse) İljin - Yaşıl - sarı gülxətmi, *Alcea hyrcana* A. Grossh. – Hirkan gülxətmi, *Alcea rosea* L. - Çəhrayı gülxətmi, *Althaea hirsuta* L. - Sərtyarpaq bəlğəmotu, *Althaea officinalis* L. - Dərman bəlğəmotu, *Althaea daghestanica* L. (*A. armeniaca* Ten.) - Dağıstan bəlğəmotu, *Althaea taurinensis* DC. – Şərq bəlğəmotu, *Althaea cannabina* L. - Çətənəvari bəlğəmotu, *Malvalthaea transcaucasica* Iljin. – Qafqaz dəlicincilimi, *Abutilon theophrasti* Medk. - Teofrast kəndirotu, *Hibiscus syriacus* L. - Suriya hibiskusu, *Hibiscus rosa* - sinensis L. - Çin qızılgülü, *Hibiscus trionum* L. - Üçər hibiscus, *Kosteletzkya pentacarpos* L. – Kanap beşmeyvə, *Gossypium hirsutum* L. – Adi pambıq, *Gossypium albescens* Raf. – Ağımtıl pambıq, *Gossypium frutescens* Lastery. – Kolvari pambıq, *Gossypium Jumelianum* (Tod.) Prokkh. – Misir pambığı) yayıldığını qeyd etmişdir. Lakin bu əsərdə Pambıq - *Gossypium* L. cinsi *Bombacaceae* fəsiləsinin tərkibində göstərilmişdir. Həmçinin *Tilliaceae* fəsiləsi ayrılıqda qeyd edilmişdir (Qrossheym, 1935: 331-347; Flora Azerbaydjana, 1953:212-259).

A.A. Qrossheym "Qafqaz florası" əsərinin VI-cı cildində Əməkömәcikimilər fəsiləsinin 12 cins və 47 növün, E.M. Qurbanov isə "Bitki sistematikası" dərs vəsaitində 9 cinsə daxil olan 35 növün Azərbaycan Respublikası ərazisində yayıldığını göstərmişdir (Qrosheym, 1950: 136-161; Qurbanov, 2009).

A.M. Əsgərovun apardığı floristik tədqiqatlar nəticəsində *Malvaceae* Juss. fəsiləsinin sistematik tərkibi geniş tədqiq edilərək, fəsilənin Azərbaycan Respublikası florasında növ tərkibi müəyyən edilmişdir. Beləliklə, A.M. Əsgərov "Azərbaycanın Bitki Aləmi" əsərində fəsilənin respublika florasında yabanı və becərilən şəraitdə 10 cinsə daxil olan 34 növünün yayıldığı haqda məlumat vermişdir (Əsgərov, 2016: 204-207).

Naxçıvan Muxtar Respublikasında T.H. Talıbov və Ə.Ş. İbrahimov tərəfindən aparılan tədqiqatlar zamanı *Malvaceae* Juss. – Əməkömәcikimilər fəsiləsinin növ tərkibini müəyyən edərək, 2008-ci ildə "Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri" kitabında fəsilənin ərazi florasında 7 cinsə daxil olan 18 növlə təmsil olunduğunu göstərmişlər. Muxtar respublika üçün Əməkömәcikimilərin taksonomik icmalı "Azərbaycan florası" əsərinə əsasən hazırlandığı üçün *Gossypium* L. - Pambıq cinsi fəsilənin tərkibinə daxil edilməmişdir. verilən T.H. Talıbov və Ə.Ş. İbrahimov tərəfindən Əməkömәcikimilər fəsiləsinin sistematik icmalı aşağıdakı kimi verilmişdir (Talıbov, İbrahimov, 2008: 121-122).

Ordo: Malvales

Familia: *Malvaceae* Juss. - Əməkömәcikimilər

**1. Genus: *Abutilon* Mill. - Kəndirotu**

1(1) *Abutilon theophrasti* Medk. - Teofrast kəndirotu

**2. Genus: *Alcea* L. - Gülxətmi**

2(1) *Alcea flavovirens* (Boiss. and Buhse) İljin - Yaşıl - sarı gülxətmi

3(2) *A. froloviana* (Litv.) Iljin (*A. nudiflora* Lindl.var.*froloviana* Litv.)-Frolov gülxətmi

4(3) *A. rosea* L. - Çəhrayı gülxətmi

5(4) *A. rugosa* Alef. - Qırışıq gülxətmi

6(5) *A. tabrisiana* (Boiss. and Buhse) Iljin - Təbriz gülxətmi

**3. Genus: Althaea L. - Bəlğəmotu**

7(1) *Althaea armeniaca* Ten. – İrəvan bəlğəmotu

8(2) *A. cannabina* L. - Çətənəvari bəlğəmotu

9(3) *A. hirsuta* L. - Sərtyarpaq bəlğəmotu

10(4) *A. officinalis* L. - Dərman bəlğəmotu

**4. Genus: *Hibiscus* L. - Hibiskus**

11(1) *Hibiscus trionum* L. - Üçər hibiskus

12(2)**H. rosa - sinensis* L. - Çin qızılgülü

13(3)**H. syriacus* L. - Suriya hibiskusu
14(4)**H. esculentus* L. – Yeyilən bamiyə
**5. Genus: *Lavatera* L. - Xətmi**
15(1) *Lavatera thuringiaca* L. - Türüngə xətmi
**6. Genus: *Malva* L. - Əməköməci**
16(1) *Malva sylvestris* L. - Meşə əməköməcisi
17(2) *M. neglecta* Wallr. - Alaq əməköməci
**7. Genus: *Malvella* Jaub. and Spach. - Köməci**
18(1) *Malvella sherardiana* (L.) Jaub. and Spach - Jerard köməcisi

Daha sonra Akademik T.H. Talıbov, Ə.Ş. İbrahimov və Ə. İbrahimovun genetik və molekulyar sistematikaya əsaslanaraq 2021-ci ildə APG sisteminə uyğun ərsəyə gətirdikləri "Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri" kitabında Əməköməcikimilər – Malvaceae Juss. fəsiləsinin taksonomik spektrini aşağıdakı kimi vermişlər (Talıbov, İbrahimov, İbrahimov, 2021: 144-145):

Ordo: *Malvales* Juss. ex Bercht. and J.Presl
Familia: *Malvaceae* Juss., nom. cons. - Əməköməcikimilər
Subfamilia: *Malvoideae* Burnett
Triba: *Malveae* J. Presl
**1. Genus: *Abutilon* Mill. - Kəndirotu**
1(1) *Abutilon theophrasti* Medk. - Teofrast kəndirotu
**2. Genus: *Alcea* L. - Gülxətmi**
2(1) *Alcea flavovirens* (Boiss. & Buhse) İljin - Yaşıl - sarı gülxətmi
3(2) *A. froloviana* (Litv.)Iljin (*Althaea nudiflora* Lindl. var.froloviana Litv.)-Frolov g.
4(3) *A. rosea* L. - Çəhrayı gülxətmi
5(4) *A. rugosa* Alef. - Qırışıq gülxətmi
6(5) *A. tabrisiana* (Boiss. & Buhse) Iljin - Təbriz gülxətmi
**3. Genus: *Althaea* L. - Bəlğəmotu**
7(1) *Althaea daghestanica* L. (*A. armeniaca* Ten.) - Dağıstan bəlğəmotu
8(2) *A. cannabina* L. - Çətənəvari bəlğəmotu
9(3) *A. hirsuta* L. - Sərtyarpaq bəlğəmotu
10(4) *A. officinalis* L. - Dərman bəlğəmotu
**4. Genus: *Malva* L. - Əməköməci**
11(1) *Malva aegyptia* L. aggr. M. iljinii İ. Riedl. - İlyin əməköməcisi
12(2) *M. sylvestris* L. - Meşə əməköməcisi
13(3) *M. neglecta* Wallr. - Alaq əməköməci
**5. Genus: *Malvella* Jaub. and Spach. - Köməci**
14(1) *Malvella sherardiana* (L.) Jaub. & Spach - Jerard köməcisi
Triba: *Hibisceae* Richb.
**6. Genus: *Hibiscus* L., nom. cons. - Hibiskus**
15(1) *Hibiscus trionum* L. - Üçər hibiskus
16(2)**H. rosa - sinensis* L. - Çin qızılgülü
17(3)**H. syriacus* L. - Suriya hibiskusu
18(4)**H. ponticus* Rupr. - Pont hibiskusu
19(5)**H. cannabinus* L. - Kənaf
**7. Genus: *Lavatera* L. - Xətmi**
20(1) *Lavatera thuringiaca* L. - Türüngə xətmi
Triba: *Gossypieae*
**8. Genus: *Gossypium* L. - Pambıq**
21(1)**Gossypium hirsutum* L. - Uplaq pambığı
**9. Genus: *Abelmoschus* Medik. - Bamiyə**
22(1)**Abelmoschus esculentus* (L.) Moench - Yeyilən bamiyə

Aparılan elmi-tədqiqat nəticəsində, ədəbiyyat məlumatlarına və herbari fondunda olan materiallara əsaslanaraq Naxçıvan Muxtar Respublikası florasında Əməköməcikimilər fəsiləsinin sistematik tərkibinin bir yarımfəsilə (*Malvoideae* Burnett), 3 triba, 9 cinsə (*Abutilon* Mill. - Kəndirotu, *Alcea* L. - Gülxətmi, *Althaea* L. - Bəlğəmotu, *Malva* L. - Əməköməci, *Malvella* Jaub. & Spach. - Köməci, *Hibiscus* L., nom. cons. – Hibiskus, *Lavatera* L. - Xətmi, *Gossypium* L. – Pambıq, *Abelmoschus* Medik. - Bamiyə) daxil olan 22 növlə təmsil olunduğunu dəqiqləşdirmişik. Həmçinin aparılan tədqiqatlar nəticəsində müəyyən olunmuşdur ki, *Malvaceae* Juss. fəsiləsinin floraya daxil olan 22 növündən 6-sı (*Hibiskus rosa - sinensis* L. - Çin qızılgülü, *Hibiskus syriacus* L. - Suriya hibiskusu, *Hibiskus ponticus* Rupr. - Pont hibiskusu, *Hibiskus cannabinus* L. - Kənaf, *Gossypium hirsutum* L. - Uplaq pambığı və *Abelmoschus esculentus* (L.) Moench - Yeyilən bamiyə) müxtəlif məqsədlər üçün mədəni florada becərilir.

Floranın coğrafi - genetik elementlərin öyrənilməsi, ayrı-ayrı bitki növlərinin əmələgəlmə mərkəzlərinin müəyyən edilməsi botaniki-coğrafi rayonlaşdırılması sahəsində bir çox görkəmli alimlər tədqiqatlar aparmışlar. Bu məsələlər A.A. Qrossheym, E.M. Lavrenko, A.T. Fedoruk və b. tərəfindən tədqiq olunub. A.A. Qrossheym bir çox floristik xüsusiyyətlərinə görə Naxçıvan Muxtar Respublikasını müstəqil floristik dairə və rayona ayırmış və onu İran Əyalətinə daxil etmişdir. Ərazi florası milyon illər ərzində tarixi inkişaf yolu keçmiş və formalaşmışdır. Ə.Ş. İbrahimov muxtar respublika florasında coğrafi areal tipi müəyyən olmayan 370 bitki növünün olduğunu müəyyən etmiş və onlardan 327 növün yayıldığı rayonu və coğrafi areal tipini vermişdir. Onlar 7 areal tipinin 12 sinif və qrupunda təmsil olunurlar. Ümumiyyətlə, bütövlükdə region florasının 7 arel tipinin 212 sinif və qrupunun olduğu məlum olmuşdur (Qrossheym,1949: 328-333; Lavrenko, 1949: 53-66; Fedoruk, 1976: 78-83; Portenier, 2000: 26-33).

Apardığımız tədqiqat zamanı Naxçıvan Muxtar Respublikası florasına daxil olan Əməkoməcikimilər – *Malvaceae* Juss. fəsiləsi bitkilərinin coğrafi areal tiplərinə görə təhlili aparılmışdır. Floranın coğrafi-genetik elementlərinin öyrənilməsi, ərazidə ayrı-ayrı bitki növlərinin əmələgəlmə mərkəzlərini müəyyən etməyə, botaniki-coğrafi rayonlaşdırma sahəsində tədqiqatlara imkan yaratmışdır. Müəyyən olunmuşdur ki, muxtar respublika ərazisində yayılan 22 növ fəsilə nümayəndələri 8 areoloji tiplərdə (Aralıqdəniz, İran-Turan, Qərbi Asiya, Kiçikasiya, Qərbi-paleoarktik, Şərqi-Asiya, Qafqaz, Avropa) birləşmişdir.

Aralıqdəniz coğrafi tipinə fəsilə nümayəndələrinin 7 növü (*Abutilon theophrasti* Medk.-Teofrast kəndirotu, *Alcea rosea* L. – Çəhrayı gülxətmi, *Althaea cannabina* L. – Çətənəvari bəlğəmotu, *Althaea hirsuta* L. – Sərtyarpaq bəlğəmotu, *Malvella sherardiana* (L.) Jaub. and Spach. – Jerard köməcisi, *Hibiscus rosa - sinensis* L.- Çin qızılgülü, *Hibiscus ponticus* Rupr. – Pont hibiskusu) daxildir ki, bu da ümumi növlərin 31, 82%-ni təşkil edir.

Naxçıvan Muxtar Respublikası ərazisində yayılan Əməkoməcikimilər fəsiləsinin 5 növü (*Alcea flavovirens* (Boiss. and Buhse) İljin. – Yaşıl-sarı gülxətmi, *Alcea rugosa* Alef.- Qırışıq gülxətmi, *Malva aegyptia* L. (aggr. *M. iljinii* İ. Riedl.) – İlyin əməkoməcisi, *Hibiscus trionum* L. – Üçər hibiskus, *Hibiscus cannabinus* L. – Çətənəvari hibiskus) İran-Turan coğrafi elementinə daxil edilmişdir ki, bu da növlərin 22,73% -ni əhatə edir.

Qərbi-paleoarktik coğrafi tipi ərazidə yayılan Əməkoməcikimilərin 3 növünü (*Althaea officinalis* L. – Dərman bəlğəmotu, *Malva sylvestris* L. – Meşə əməkoməcisi, *Malva neglecta* Wallr. in Syll. Ratisb. – Alaq əməköməci) əhatə edir ki, bu da ümumi növlərin 13,64%-ni təşkil edir.

Naxçıvan Muxtar Respublikası florasında *Malvaceae* Juss. fəsiləsinə daxil olan 3 növ (*Alcea froloviana* (Litv.) Iljin. – Frolov gülxətmi, *Lavatera thuringiaca* L. – Türüngə gülxətmi, *Abelmoschus esculentus* (L.) Moench Meth. – Yeyilən bamiyə) Avropa coğrafi tipini əhatə edir ki, bu da ümumi növlərin 13,64%-ni əhatə edir.

Əməkoməcikimilər fəsiləsinin bir növü - *Alcea tabrisiana* (Boiss. and Buhse) Iljin. – Təbriz gülxətmi Qərbi Asiya coğrafi tipinə daxil edilmişdir.

Kiçikasiya coğrafi tipinə ərazidə yayılan *Althaea daghestanica* L. (*A. armeniaca* Ten.). – Dağıstan bəlğəmotu növü daxil edilmişdir.

Şərqi-Asiya coğrafi tipi də florada yayılan bir növlə (*Hibiscus syriacus* L. – Suriya hibiskusu) təmsil olunur.

Qafqaz coğrafi tipi də həmçinin bir növlə (*Gossypium hirsutum* L. – Uplaq pambıq) təmsil olunur.

Naxçıvan Muxtar respublikası florasına daxil olan *Malvaceae* Juss. – Əməköməcikimilər fəsiləsi bitkilərini coğrafi təhlil edərkən aşağıda verilən cədvəldən də göründüyü kimi Aralıqdəniz coğrafi elementinə 7 növ daxildir ki, bu da ümumi növlərin 31,82 % - ni təşkil edir. Bundan başqa İran-Turan çoğrafi elementi 5 növlə, 22,72 %-i, Qərbi-paleoarktik coğrafi elementi 3 növlə, 13,63 %, Avropa coğrafi elementi 3 növlə, 13, 63 %, Qərbi Asiya, Kiçikasiya, Şərqi-Asiya və Qafqaz coğrafi elementlərinin hər biri bir növlə təmsil olunaraq, ayrı-ayrılıqda 4,55 % təşkil edirlər.

**Cədvəl**

**Naxçıvan Muxtar Respublikası florasında Əməköməcikimilər fəsiləsinə daxil olan növlərin coğrafi areal elementlərinin % göstəricisi**

| S№ | Coğrafi areal elementləri | Növün adı | %-lə göstərici |
|---|---|---|---|
| 1. | Aralıqdəniz | Teofrast kəndirotu, Çəhrayı gülxətmi, Çətənəvari bəlğəmotu, Sərtyarpaq bəlğəmotu, Jerard köməcisi, Çin qızılgülü, Pont hibiskusu | 31,82 |
| 2. | İran-Turan | Yaşıl-sarı gülxətmi, Qırışıq gülxətmi, İlyin əməköməcisi, Üçər hibiskus, Çətənəvari hibiskus | 22,72 |
| 3. | Qərbi-paleoarktik | Dərman bəlğəmotu, Meşə əməköməcisi, Alaq əməköməci | 13,63 |
| 4. | Avropa | Frolov gülxətmi, Türüngə gülxətmi, Yeyilən bamiyə | 13,63 |
| 5. | Qərbi Asiya | Təbriz gülxətmi | 4,55 |
| 6. | Kiçikasiya | Dağıstan bəlğəmotu | 4,55 |
| 7. | Şərqi-Asiya | Suriya hibiskusu | 4,55 |
| 8. | Qafqaz | Uplaq pambıq | 4,55 |

## Nəticə

Müasir tədqiqat üsullarına əsaslanaraq apardığımız tədqiqat işləri nəticəsində və ədəbiyyat məlumatlarına əsasən Naxçıvan Muxtar Respublikası florasında Əməköməcikimilər - *Malvaceae* Juss. fəsiləsinin 22 növünün yayıldığı müəyyən edilmişdir ki, onların 6 növü mədəni florada müxtəlif məqsədlərlə becərilir. Floranın əmələ gəlməsində böyük rol oynayan fəsilə nümayyəndələrinin adlandırılması və sistematik tərkibi APG IV sisteminə əsasən verilmişdir.

## Ədəbiyyat

1. APG III. (2009). An update of the Angiosperm Phylogeny Group classification for the orders and families of flowering plants. APG III. Botanical Journal of the Linnean Society 161: 105 – 121.
2. Əsgərov, A.M.(2016). Azərbaycanın bitki aləmi (Ali bitkilər - Embryophyta). Bakı: TEAS Press Nəşriyyat evi, 443 s.
3. İbadullayeva, S.J., Babakishiyeva, T.S., Askerova, A.A.(2013). Forage quality of the species of Malva L. genus and definition of organic remainders in the cut areas.//International Journal of Agriculture and Crop sciences. pp. 1328-1333. Impact factor: 0.84- B. London-UK.

4. İbadullayeva, S.J.(2015). Economic benefits species of the Introduced genus of Malva L. // International Journal of Advanced Multidisciplinary Research (IJAMR), ISSN 2393-8870,Volume 2, Number 4, pp. 114-117. India.
**5.** İbadullayeva, S.C. (2012). Azərbaycan florasında yayılan əməköməci (Malva L.) cinsi. // AMEA Xəbərlər Biologiya seriyası.№-3, s.127-129.
6. Qrossheym, A.A. (1935). Azərbaycan florası. Bakı: Azərnəşr, Kənd təsərrüfatı şöbəsi. Cild VI, 543 s.
7. Qurbanov, E.M.(2009). Ali bitkilərin sistematikası. Dərslik. Bakı: “Bakı Universiteti” nəşriyyatı, 429 s.
8. Talıbov, T.H., İbrahimov, Ə.Ş. (2008). Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri (Ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilər). Naxçıvan: Əcəmi, 364 s.
9. Talıbov,T., İbrahimov, Ə., İbrahimov, Ə.(2021). Naxçıvan Muxtar Respublikası florasının taksonomik spektri (Ali sporlu, çılpaqtoxumlu və örtülütoxumlu bitkilər) (II nəşr). 426 s.
10. Qrossqeym, A.A. (1949). Opredelitel pasteniy Kavkaza. Qosudarstvennoe izdatelstvo. Sovetskaya nauka. Mockva, 747 s.
11. Qrossqeym, A.A.(1950). Flora Kavkaza. Moskva-Leninqrad: İzdatelstvo AN SSSR T. 6. s.311.
12. Fedoruk, A.T. (1976). Botanicheskaya geografiya. Polevaya praktika. – Mn.: İzd-vo BQU, 224 s.
13. Flora Azerbaydjana.(1953). Baku: İz-vo Akademii Nauk Azerbaydjanskoy SSR, T. 4, 403 s.
14. Lavrenko, E.M.(1949). O fitoqeosfere// Voprosı qeoqrafii: Fizicheskaya geografiya. M.: Geografgiz, Sb. 15. s. 53-66.
15. Portenier, N.N. (2000). Sistema geograficheskix elementov flori Kavkaza // Botanicheskiy Jurnal № 9, s. 26-33

Göndərilib: 12. 08. 2023 Qəbul edilib: 29.10.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/66-72

**Nurlibay Mirzambetov**
Karakalpak Research Institute of Natural Sciences
PhD student
nmirzambetov@umail.uz
**Iskandar Mirabdullayev**
Karakalpak Research Institute of Natural Sciences
mirabdullaevi@umail.uz

# ZOOPLANKTON OF FRY FISHPONDS IN THE SOUTH OF KARAKALPAKSTAN

## Abstract

A detailed (samples were taken every other day (sometimes daily)) zooplankton succession of four fry fishponds in the farm “Super baliqlar” of the Turtkul district of Karakalpakstan was investigated. 30 species were recorded - 14 species of rotifers, 10 - cladocerans, 6 - copepods. All species are common for the hydrofauna of Uzbekistan. Crustacean plankton dominated quantitatively.

Rotifers- *Brachionus calyciflorus, B. quadridentatus, Hexartra mira, Asplanchna sieboldi* and crustaceans *Moina weismanni, Diaphanasoma macrophtalma, Phyllodiaptomus blanci, Thermocyclops taihokuensis, Acanthocyclops trajani* dominated. The succession of development dynamics of individual taxonomic groups of zooplankters has been determined. The maximum development of rotifers occurred on days 5-8 after filling the ponds, the maximum development of cladocerans on days 7-16, and the maximum development of copepods on days 10-16 after filling the ponds.

***Keywords:*** *fry fishponds, zooplankton, succession, numbers, biomass, Turtkul region, Karakalpakstan, Uzbekistan*

**Nurlibay Mirzambetov**
Qaraqalpaq Elmi-Tədqiqat Təbiət Elmləri İnstitutu
PhD student
nmirzambetov@umail.uz
**Iskandar Mirabdullayev**
Qaraqalpaq Elmi-Tədqiqat Təbiət Elmləri İnstitutu
mirabdullaevi@umail.uz

## Qaraqalpağın cənubunda balıqyetişdirmə vətəgələrinin zooplanktonu

## Xülasə

Qaraqalpağın Turtkul mahalındakı "Super baliqlar" fermasındakı dörd balıqyetişdirmə gölünün (nümunələr hər gün (bəzən gündəlik) götürülmüşdür) zooplankton nəticəsi araşdırılmışdır. 30 növ - rotiferlərin 14 növü, kladokeranların 10 növü, kopepodların 6 növü qeydə alınıb. Bütün növlər Özbəkistanın hidrofaunası üçün xarakterikdir. Krustas planktonu kəmiyyətcə üstünlük təşkil edir.

Rotiferlərin növləri- *Brachionus calyciflorus,* Dörddanlı Rotifer *(B. Quadridentatus),*Mira Rotifer *(Hexartra mira),* Sieboldi rotiferi*( Asplanchna sieboldi)* və xərçəngkimilər –Vaysman xərçəngkimiləri (Moina *Weismanni),* Büyük Gözlü Şəffaflı xərçəngkimiləri *(Diaphanasoma macrophtalma),* Blancın Yarpaqgöz xərçəngkimiləri *(Phyllodiaptomus blanci),* Tayhoku Thermosiklop *(Thermocyclops taihokuensis),* Trajan Tikanlı Siklop*( Acanthocyclops trajani)* üstünlük təşkil edir. Zooplanktların fərdi taksonomik qruplarının inkişaf dinamikasının uğurlu nəticəsi müəyyən edilmişdir. Riferlərin maksimal inkişafı 5-8-ci günlərdə gölməçələrin

dolmasından sonra, kladokeranların maksimal inkişafı 7-16-cı günlərdə, kopepodların maksimum inkişafı isə 10-16-cı günlərdə gölməçələrin dolmasından sonra baş verib.

***Açar sözlər:*** *balıqyetişdirmə vətəgələri, zooplankton, varislik, saylar, biokütlə, Türtkül vilayəti, Karakalpakstan, Özbəkistan*

## Introduction

Fish fry (juvenile) ponds are small ponds with an area usually of several hundred square meters, in which the larvae of pond fish are raised for 2-3 weeks. Empty fry ponds are filled with water and larvae are released into them after 1-2 days. The zooplankton of fry ponds practically was not studied even on a global scale. In Uzbekistan, only planktonic ciliates (Mirabdullaev, 1988:62-65) and higher plants (Bakhodirova, 1989: 18) of fry ponds in the Tashkent region have been studied in detail, and studies of metazoan plankton (rotifers, crustaceans) in fry ponds began (Mirzambetov, Mirabdullaev, 2021:29-34; Mirzambetov, Mirabdullaev, 2022: 56-62).

**Material and methods.** In May-June 2022, the zooplankton of four fry ponds of the “Super baliqlar” farm in the Turtkul region of the Republic of Karakalpakstan was studied. Zooplankton samples were taken every other day with a bucket from 10 points of the pond, filtered through a conical plankton net made of a nylon sieve (No. 76) and fixed with formaldehyde to a final concentration of 2-3%. The water temperature was measured: the minimum water temperature was observed in the morning at 7-8 a. m., and the maximum at 2-3 p. m. Water transparency was measured using a Secchi disk at 2-3 p. m. Laboratory processing of samples was carried out according to standard methods in hydrobiology (Saha, Saha, Basu, 2017: 156-164; Salazkin, Ivanova, Ogorodnikova, 1984:24). Before filling ponds SB1 and SB3, 10.0 tons of manure were added to them. All ponds were filled from one supply channel with Amudarya water. Data on morphometry and operating mode of fry ponds are given in Table. 1.

**Table 1. Morphometry and operating mode of fry ponds**

| Ponds | SB1 | SB2 | SB3 | SB4 |
|---|---|---|---|---|
| Area, ha | 0.8 | 0.8 | 1.5 | 3.5 |
| Middle depth, m | 0.8-1.0 | 0.8-1.0 | 0.8-1.0 | 0.5-1.0 |
| Date of beginning of pond filling | 22.05.26 | 22.05.27 | 22.05.26 | 22.06. 01 |
| Date of finishing of pond filling | 22.05.27 | 22.05.29 | 22.05.27 | 22.06.04 |
| Species, date of stocking | Common carp, 22.06.02 | Silver carp, 22.05.31; Common carp, 22.05.31 Common carp, 22.06.02 | Silver carp, 22.05.31; Common carp, 22.05.31 Common carp, 22.06.02 | Common carp, 22.06.02 |
| Density of fish, $10^6$ spec./ha | 5.0 | Silver carp, 2.5 Common carp, 5.0 | Silver carp, 2.0 Common carp, 2.7 | 2.3 |

**Results and discussion.** Most of the bed in ponds SB1, SB2 and SB3 was covered with macrophytes (reeds) when flooded; pond SB4 was free of vegetation. Filamentous green algae *Spirogira sp*. were found; in the coastal areas of pond SB4, hard vegetation – reeds and cattails – was significantly developed; almost half of the pond bed was occupied by Characeae gen. sp. The water temperature in the ponds varied between 18.2 °C (7-8 a. m.) – 32.2 °C (2-3 p. m.).

In all ponds, transparency varied from 20 to 100 cm; on the first day after filling the ponds with water, it was cloudy, and then became more transparent. Water transparency in ponds SB1 and SB3 was high at the beginning and end of the period, and in the middle of the period it decreased slightly

ISSN: 2707-1146
e-ISSN: 2709-4189

due to the excessive reproduction of phytoplankton and Concostraca crustaceans (258.0 and 185.0 thousand ind./$m^3$, respectively), stirring up silt (Fig. 1).




**Fig. 1. Water transparency of the studied fish fry ponds**

The species composition of zooplankton in the studied ponds was quite similar; almost the same species dominated. A total of 30 species of zooplankton were recorded in four fry ponds, of which 14 species were rotifers, 10 were cladocerans, and 6 were copepods. Rotifers were more diverse (46% of total zooplankton) (Table 2).

**Table 2. Taxonomic composition of zooplankton in the studied fish fry ponds (+ – presence, ++ – dominants, – absence)**

| Taxa/Ponds | | 1 | 2 | 3 | 4 |
|---|---|---|---|---|---|
| ROTIFERA | | | | | |
| 1 | *Anuraeopsis fissa* Gosse, 1851 | - | + | - | - |
| 2 | *Asplanchna sieboldi* Leydig, 1854 | - | ++ | ++ | ++ |
| 3 | *Bdelloida gen. sp.* | + | + | - | + |
| 4 | *Brachionus angularis* Gosse, 1851 | - | - | + | - |
| 5 | *Br. calyciflorus* Pallas, 1766 | + | ++ | ++ | ++ |
| 6 | *Br. plicatilis* O.F. Müller, 1786 | - | + | - | + |
| 7 | *Br. quadridentatus* Hermann, 1783 | + | + | + | ++ |
| 8 | *Euchlanis dilatata* Ehrenberg, 1832 | - | + | - | + |
| 9 | *Hexarthra mira* Hadson, 1871 | ++ | ++ | ++ | ++ |
| 10 | *Lecane luna* O.F. Müller, 1786 | + | + | + | + |
| 11 | *L. ungulata* Gosse, 1887 | - | - | - | + |
| 12 | *Testudinella patina* Hermann, 1783 | - | + | + | - |
| 13 | *Platyias quadricornis* Ehrenberg, 1832 | + | + | + | + |
| 14 | *Polyarthra vulgaris* Carlin, 1943 | - | + | - | + |
| CLADOCERA | | | | | |
| 1 | *Moina weismanni* Ishikawa, 1896 | + | ++ | ++ | ++ |

| | | | | | |
|---|---|---|---|---|---|
| 2 | *Scapholeberis sp.* | + | + | + | - |
| 3 | *Simocephalus vetulus* O.F. Müller, 1776 | + | - | + | - |
| 4 | *Bosmina longirostris* O.F. Müller, 1776 | - | + | + | + |
| 5 | *Daphnia galeata* Sars, 1863 | + | - | + | - |
| 6 | *Diaphanasoma dubium* Manuilova, 1964 | - | - | - | + |
| 7 | *D. macrophtalma* Korovchinsky et Mirabdullaev, 1995 | + | + | + | ++ |
| 8 | *Macrothrix sp.* | + | + | + | + |
| 9 | *Coronatella cf. rectangular* | + | + | + | - |
| 10 | *Chydorus cf. sphaericus* O.F. Müller, 1776 | - | + | - | - |
| | COPEPODA | | | | |
| 1 | *Phyllodiaptomus blanci* Guerne et Richard, 1896 | + | ++ | ++ | ++ |
| 2 | *Thermocyclops taihokuensis* Harada, 1931 | + | ++ | ++ | ++ |
| 3 | *Acanthocyclops trajani* Mirabdullaev et Defaye, 2004 | ++ | ++ | ++ | ++ |
| 4 | *Mesocyclops pehpiensis* Hu, 1943 | - | + | - | - |
| 5 | *Macrocyclops albidus* Jurine, 1820 | + | - | - | - |
| 6 | *Eucyclops cf. serrulatus* Fischer, 1851 | + | + | - | - |

In general, the detected zooplankton taxa are well known in various types of water bodies of Uzbekistan and in particular in fish ponds (Kuzmetov,1998:20; Mirabdullaev, Kuzmetov, Khegai, 1994: 49-53). Many of them reported in fishponds of Asia (Saha, Saha, Basu, 2017:156-164), Europe (Goździejewska, Tucholski, 2011: 67-79), Africa (Adedeji, Adeniyi, Masundire, 2013:631-640).

Pond SB2 stood out sharply from other ponds due to the significant development of rotifers (mainly *B. calyciflorus*) on days 3-6 after flooding the pond with water, when the total number of zooplankton reached 237.0 $\cdot 10^3$ ind./m$^3$. In other ponds, the number of zooplankton did not exceed 46.5-71.0 $\cdot 10^3$ ind./m$^3$ (Fig. 2).




**Fig. 2. Dynamics of zooplankton number in the studied ponds**

The biomass of zooplankton in all ponds tended to increase towards the end of the period of operation of the ponds (Fig. 3-6), mainly due to the development of Copepoda (*Th. taihokuensis* and *Ph. blanci*). In pond SB2, in the first week after flooding, Rotifera and Cladocera dominated (Fig. 4); in pond SB3, Cladocera dominated (Fig. 5). In general, Copepoda predominated in biomass in all ponds (Fig. 3-6).

Despite the fact that the density of fish larvae in pond SB4 was 2-3 times less than in other ponds, the zooplankton biomass in it was at the same level. The highest biomass was observed in pond SB3 (Fig. 5).




**Fig. 3. Dynamics of zooplankton biomass in the fry pond SB1**




**Fig. 4. Dynamics of zooplankton biomass in fry pond SB2**




**Fig. 5. Dynamics of zooplankton biomass in fry pond SB3**




**Fig. 6. Dynamics of zooplankton biomass in fry pond SB4**

All ponds were dominated by rotifers *Asplanchna sieboldi*, *Brachionus calyciflorus*, *B. quadridentatus* and *Hexartra mira*, crustaceans *Moina weismanni*, *Diaphanasoma macrophtalma*, *Thermocyclops taihokuensis*, *Acanthocyclops trajani* and *Phyllodiaptomus blanci* (Table 1). The maximum development of rotifers occurred on days 5-8 after filling the ponds, the maximum development of cladocerans on days 7-16, and the maximum development of copepods on days 10-16 after filling the ponds. A similar direction of zooplankton succession was observed in fry ponds in the Tashkent region (Mirabdullaev, Khegai, Akhmedov, 1991:146-147).

## References

1. Mirabdullaev, I.M. (1988). Development of planktonic ciliates in fry ponds of the Tashkent region. Uzbek. Biol. J. №. 6, pp.62-65 [in Russian].
2. Bakhodirova, Z.A. (1989). Flora and vegetation of nursery (fry) fishponds in the Tashkent region of the UzSSR and rational ways of their use in pond fish farming. Thesis PhD Biol. Sci. Tashkent, 18 p. [in Russian].
3. Mirzambetov, N.A., Mirabdullaev, I.M. (2021). Zooplankton of fish fry ponds in the South of Karakalpakstan. Uzbek. Biol. J. № 6, pp.29-34. [in Russian].
4. Mirzambetov, N.A., Mirabdullaev, I.M. (2022). Zooplankton of fish fry ponds in the Central region of Karakalpakstan. Uzbek. Biol. J. № 1, pp.56-62.
5. Saha, S., Saha, T., Basu, P. (2017). Seasonal changes in zooplankton and macrofauna populations of the East Calcutta wetland fish ponds. Proceed. Zool. Soc. Vol. 70, pp.156-164.
6. Salazkin, A.A., Ivanova, V.A., Ogorodnikova, V.A. (1984). Methodological recommendations for collecting and processing materials during hydrobiological studies in freshwater bodies. Zooplankton and its products. Leningrad, 24 p. [in Russian].
7. Kuzmetov, A.R. (1998). Zooplankton of fishponds in Uzbekistan. Thesis PhD Biol. Sci. Tashkent, 20 p. [in Russian].
8. Mirabdullaev, I.M., Kuzmetov, A.R., Khegai, V.N. (1994). Zooplankton of fish ponds in the southern regions of Uzbekistan. Uzbek. Biol. J. № 1, pp.49-53. [in Russian].
9. Saha, S., Saha, T., Basu, P. (2017). Seasonal changes in zooplankton and macrofauna populations of the East Calcutta wetland fish ponds. Proceed. Zool. Soc. Vol. 70, pp.156-164.
10. Goździejewska, A., Tucholski, S. (2011). Zooplankton of fish culture ponds periodically fed with treated wastewater. Pol. J. Environ. Stud. Vol. 20, pp.67-79.
11. Adedejiç, A.A., Adeniyiç, I.F., Masundire, H. (2013). Zooplankton abundance and diversity of fishponds exposed to different management practices. Int. J. Biol. Chem. Sci. Vol. 7, pp.631-640.
12. Mirabdullaev, I.M., Khegai, V.N., Akhmedov, H.Yu. (1991). Succession of zooplankton in juvenile ponds of Uzbekistan. 6th Congr. VGBO. Murmansk, Part 1, pp.146-147 [in Russian].

Received: 08.10.2023 Accepted: 03.11.2023

DOI: https://doi.org/10.36719/2707-1146/38/73-77

**Gülnarə Abbasova**
Azərbaycan Dövlət Aqrar Universiteti
abbasovag13@gmail.com

# TÜTÜN BİTKİSİNİN BECƏRİLMƏ TEXNOLOGİYASI VƏ AZƏRBAYCANDA TÜTÜNÇÜLÜK SƏNAYESİ

**Xülasə**

Bu məqalə Azərbaycanda tütün bitkisinin istehsalı, onun emalının təhlili və zəruri dəyərləndirmələri haqqında məlumat verir. Bununla yanaşı tütün becərilmə texnologiyası və tütün emalının inkişaf istiqamətləri nəzərdən keçirilir, ölkədə tütünçülüyün və tütün fermentasiyasının inkişafının sürətləndirilməsinin zəruriliyi açıqlanır. Azərbaycanın qeyri-neft sektorunda rəqabət qabiliyyətinin yüksəldilməsi və səmərəliliyin artırılması fonunda tütünçülük və onun məhsulunun emalı müəssisələrinin inkişafına diqqətin gücləndirilməsinin məqsədəuyğun olduğu göstərilir. Tütünçülük sənayesinin inkişafında klasterlərin daha səmərəli ola biləcəyi əsas götürülür və bəzi konkret təkliflər verilir.

***Açar sözlər:*** *tütün bitkisi, tütünçülük, yetişdirmək, toxum, suvarma, fidan*

**Gulnara Abbasova**
Azerbaijan State Agrarian University
abbasovag13@gmail.com

## Tobacco plant cultivation technology and tobacco industry in Azerbaijan

**Abstract**

This article provides information about the production of tobacco plant in Azerbaijan, analysis of its processing and necessary evaluations. At the same time, the development directions of tobacco cultivation technology and tobacco processing are reviewed, the necessity of accelerating the development of tobacco farming and tobacco fermentation in the country is explained. Against the background of increasing competitiveness and increasing efficiency in the non-oil sector of Azerbaijan, it is indicated that it is appropriate to focus on the development of tobacco and its product processing enterprises. It is assumed that clusters can be more efficient in the development of the tobacco industry, and some concrete proposals are made.

***Keywords:*** *tobacco plant, tobacco growing, growing, seeds, irrigation, seedling*

## Giriş

Tütünün istifadəsi qədim dövrlərə gedib çıxır. İlk dəfə tütün Amerikanın yerli xalqları tərəfindən dərman məqsədi ilə becərildiyi güman edilirdi. Tütün XV əsrin sonlarında Xristofor Kolumb tərəfindən Avropaya təqdim edilmiş bir ticarət növü idi. Tütün tərkibində çoxlu sayda insan sağlamlığı üçün zərərli olan müxtəlif kimyəvi maddələr olan bir bitkidir. Tütün yandırıldıqda və ya qızdırıldıqda çoxlu zəhərli maddələr, o cümlədən qatran, karbonmonoksit və müxtəlif kanserogenlər buraxır.

Tütün ən azı 124 ölkədə dünyanın 4,3 milyon hektardan çox kənd təsərrüfatı sahəsində becərilir və bütün İsveçrə ölkəsi ilə bərabər əkin sahələrini istehlak edir. 100-dən çox ölkə tütün yetişdirir. 2014-cü ildə tütün yetişdirən beş aparıcı ölkə Çin, Braziliya, Hindistan, ABŞ və İndoneziya olmuşdur (Korqasbekova, Kasimova, Zaynulina, 2020: 15-35). Təkcə Çin 2012-ci ildə qlobal miqyasda yetişdirilən 7,5 milyon ton tütünün təxminən yarısını istehsal edib.Tütün daha yoxsul torpaqlarda inkişaf edərək fermerlərə xoş alternativ məhsul təqdim edir. Bir çox hallarda digər məhsullardan daha yüksək gəlir gətirir.

1960-cı illərdən etibarən tütünçülük yüksək gəlirdən, əsasən aşağı və orta gəlirli ölkələrə keçdi. Bu dəyişiklik daha çox 20-dən çox Afrika ölkəsinin tütün yetişdirdiyi Afrikada özünü göstərir.

Tütün bitkisi pomidor, kartof, bibər və badımcanla eyni botanika ailəsinə aiddir. Mühitə uyğunlaşan növ, 50° şimaldan 40° cənub enliyinə qədər iqtisadi cəhətdən yetişdirilə bilər.

Tütün yarpaqlarının kimyəvi tərkibində nikotin maddəsi var. Bu maddə zəhərlidir və müntəzəm istifadə edildikdə fiziki və psixoloji səviyyədə asılılıq yaradır. Qədim dövrlərdən bəri tütün tanrılarla ünsiyyət üçün rituallar zamanı çəkilir və çeynənir.

Tütün yetişdirmə texnologiyası bir çox bitki yetişdirmək texnologiyası ilə eynidir. Əvvəlcə toxumları səpmək, sonra fidanları yetişdirmək və hazırlanmış torpağa və ya istixanaya köçürmək lazımdır (“Azərbaycan Respublikasında tütünçülüyün inkişaf etdirilməsinə dövlət dəstəyi haqqında” Azərbaycan Respublikası Prezidentinin Sərəncamı, 2017).

Evdə özünüz tütün yetişdirməyə başlamazdan əvvəl ortaya çıxan ilk sual tütün növlərini haradan əldə etmək və onu necə yetişdirməkdir? Seçilmiş tütün çeşidini almazdan əvvəl, əvvəlcə ərazinin torpaq və temperatur şəraitini nəzərə alaraq bu növ tütünün becərilməsinin xüsusiyyətləri ilə tanış olmaq məsləhətdir. Ukraynadakı onlayn mağazalar ən məşhur sortların geniş çeşidli tütün toxumlarını təklif edir: Virginia, American 26, Burley, Kentucky, Dubek, Samsun 85 (Avropa versiyası) və Boliviya qara. Seçilmiş tütün əvvəlcədən isti yerdə fidan kimi əkilməlidir. Toxumlar xüsusi istixanalarda bağçaya köçürülməzdən 40-45 gün əvvəl əkilir. Bu, təxminən fevralın sonu, martın əvvəlidir.

Tütün toxumları ilkin əkin zamanı temperatur şəraitinə həssasdır. Tütün toxumlarının yetişdirilməsi otaq və ya istixana temperaturunda +25 - +28$^{o}$ C təsirli olacaq. Aşağı temperaturda toxum ölə bilər və cücərməz. Ticarət satış üçün böyük plantasiyalardan istifadə etməyi planlaşdırarkən, xüsusi təchiz olunmuş uşaq bağçasında və ya istixanada tütün əkməkdən daha yaxşı həll yolu yoxdur.

Toxum hazırlığı və səpin tütün yetişdirilməsində ilk addımdır. Toxum səpmək üçün hündürlüyü 4-7 sm olan enli qablar daha əlverişlidir. Dibində deşik olan qablar əla seçimdir. Konteynerdə heç bir deşik yoxdursa, suvarma zamanı artıq suyu axıtmaq mümkün deyil (Moiseyeva, 2008: 250). Hər hansı bir universal torpaq qapalı bitkilər üçün uyğundur. Toxumların bir ay yarım əvvəl əkilməsi ilə əkin etməzdən əvvəl torpağın keyfiyyətini yoxlamaq mümkündür. Toxumlar ölürsə, o zaman torpaqda kif və ya çox miqdarda mineral gübrə ola bilər ki, bu da bitkinin kiçik tumurcuqlarına zərər verir. Hazırlıq prosesindən sonra alınan fidandan tütün yetişdirilməsi bir neçə sadə prosesdən ibarət olacaq.

- bir salfet üzərinə az miqdarda toxum tökülür;
- toxumlar barmağınızla salfetdən diqqətlə yığılır;
- hazırlanmış toxumları torpağın səthinə barmağınızla yerlədiri;
- toxumları qabın səthinə yerləşdirmək məqsədəuyğundur;
- gələcək fidanlar istixana effekti üçün qapaq və ya yapışqan filmlə örtülür;
- toxumlar gündə 3-5 dəfə ventilyasiya ilə iki gün istixanada saxlanılır;
- sonra istixana bir az açılır və 7 gündən sonra tamamilə çıxarılır;
- fidanların kiçik tumurcuqları hazırdır (Qurbanov, 2009).

***Torpağa tütün necə əkmək olar?***

Bağın və ya plantasiyanın torpağında tütün şitillərinin əkilməsi toxum səpildiyi andan 40-45 gün sonra başlayır. Bitki ən azı 15 sm hündürlüyə, 6 ədədə qədər inkişaf etmiş yarpaqlara və güclü kök sisteminə malik olmalıdır. Qismən dərinlikdə torpağın temperaturu gecə ən azı 10$^{o}$ C olmalıdır. Fidanı açıq yerə əkmək üçün ən yaxşı dövr bölgədən asılı olaraq aprelin sonu - mayın ortaları hesab olunur. Fidanlıqdakı hər bir bitki bir-bir əvvəlcədən hazırlanmış və bolca suvarılan çuxura köçürülür. Konteynerdən çıxan "doğma" torpaq köklərdə saxlanılır və bitki ilə birlikdə çuxura köçürülür. Kökün üstünü bağdan gələn torpaqla yaxşıca örtün. Bütün yay dövründə tütün 3 dəfə bol su ilə suvarılır, hər çuxur üçün 6-8 litr. Həddindən artıq suvarma bitkinin ölümünə səbəb ola bilər. Çiçəkləmə dövründə çiçək salxımlarıda yan tumurcuqları ilə birlikdə qırılmalıdır (“Tütün və tütün məmulatı haqqında” Azərbaycan Respublikasının Qanunu, 2001).

